***Mən Aşığam, ha kərim,***
***Dada yetiş, ha Kərim!***
***Sizə sizin gen dünya,***
***Mənə mənim Həkərim!***
**Sarı Aşıq**



**№4(11)**
**2013**

**Bakı-2013**

**Laçın yurdu, №4(11), 2013**
**Bakı, "Bəxtiyar-4", 2013. – 96 səh.**



Redaksiyanın ünvanı:
**Sabit Rəhman küç. 7**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**



Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

**HÖRMƏTLİ OXUCULAR!**

**"Hər kənddən, hər məktəbdən 1 abunəçimiz olsun, hər kəs 1 jurnal alsın!"** kampaniyası davam edir. Bu kampaniyaya qoşulanlara bəri başdan öz təşəkkürümüzü bildiririk.

Xatırladaq ki, jurnalımızı metro keçidlərindən və "Azərmətbuatyayımı"nın Sumqayıt, Gəncə, Mingəçevir, Bərdə, Ağcabədi, Yevlax, Qax və Şəki şəhərlərindəki köşklərindən almaq olar.

**Əziz oxucular,** jurnalımız hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır, **illik abunə qiyməti 8 manatdır.** İnşallah, növbəti sayımız **2013-cü ilin dekabr ayında** işıq üzü görəcək.

## ALİ MƏKTƏBLƏRƏ QƏBUL OLUNAN LAÇINLI TƏLƏBƏLƏRLƏ ZİYALILARIN GÖRÜŞÜ

Sentyabrın 21-də Rəşid Behbudov adına Mahnı Teatrında 2013-2014-cü tədris ili üçün ali məktəblərə qəbul imtahanlarında uğur qazanmış laçınlı tələbələrlə görüş keçirilmişdir.

Laçın Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə keçirilən tədbirdə tələbələr, müəllim kollektivləri və valideynlərlə yanaşı, Laçın rayonundan olan ziyalılar, ali məktəb müəllimləri də iştirak etmişlər.



Tədbiri giriş nitqi ilə açan Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov tələbə adını qazanan məzunları, onların valideynlərini və müəllimlərini təbrik etdi, dövlətimizi və bayrağımızı həmişə uca tutmalarını arzuladı. Ümummilli lider Heydər Əliyevin təhsillə bağlı qarşıya qoyduğu strateji məqsədin bu gün ölkə başçısı İlham Əliyev tərəfindən uğurla davam etdirildiyini deyən natiq ulu öndərin vaxtı ilə çox sayda Azərbaycanlı gənci dünyanın yüksək səviyyəli universitetlərinə təhsil almağa göndərdiyini bildirdi. Qeyd etdi ki, hazırda ölkənin təhsil sahəsinin qloballaşan dünyanın tələbləri səviyyəsində qurulması milli təhsil sisteminin gerçəkləşməsinə maddi-texniki və intellektual zəmin yaradıb.

İcra başçısı bu il Laçın rayonunun məktəblərini bitirmiş məzunlardan 206 nəfərin respublikanın müxtəlif ali məktəblərinə qəbul olunmasını rayonun tarixində ən yüksək göstərici kimi dəyərləndirdi. O, laçınlı gənclərlə

tanınmış ziyalılarımız arasında geniş əlaqələrin qurulması istiqamətində mühüm addımların atılacağını vurğuladı: "Biz belə qərara gəldik ki, müxtəlif vaxtlarda Laçın təhsilinin yetişdirmələri olan, paytaxtda təhsil ocaqlarına qəbul olunaraq elmi nailiyyətlər qazanan, Laçınımızı məşhurlaşdıran ziyalılarımızdan bir qrupunu dəvət edək. Düşündük ki, bu sintez, bu birgəlik və burada olacaq söhbətlər bütövlükdə gənclərimiz üçün, məşhur iş adamlarımız üçün, alimlərimiz üçün dəyərli olacaq. Xüsusilə, balalarımıza müraciət edirəm ki, Laçınımıza daim başucalığı gətirən, nailiyyətləri respublikamızın hüdudlarını aşan ziyalılarımızı yaxından tanısınlar. Çünki onlar mövcud olan intellekt reallığıdır. Siz isə hələ o reallığın astanasındasınız".



Akif Səlimov çıxışında Laçınlı gənclərin hərbi hazırlığına ayrıca diqqət ayırdı, bu sahədə peşəkar kadrların yetişdirilməsinin vacibliyini önə çəkdi. 37 №li tam orta məktəbin məzunu Həsənov Asiman Bayandur oğlu və Qarakeçdi kənd tam orta məktəbinin məzunu Fərzəliyev Rəmzi Nüsrət oğlunun H.Əliyev adına Hərbi Akademiyaya qəbul olunmalarını yüsək qiymətləndirdi. Gələcəkdə hərbçi peşəsinə maraq göstərən gənclərin artacağına əminliyini dilə gətirdi və ali hərbi məktəblərə qəbul olunan laçınlı gənclərə icra hakimiyyətinin ayda 300 manat ayırması haqqında qərarının qüvvədə qaldığını xatırlatdı.

Tədbirdə çıxış edən Laçın rayon Təhsil Şöbəsinin müdiri Malik Vəliyev bildirdi ki, rayonumuzun ümumtəhsil məktəblərinin buraxılış imtahanlarındakı göstəriciləri respublika göstəricisindən yüksək olmuşdur. Ötən dərs

ilinin XI sinfində təhsil alan 572 nəfər şagirddən 447 nəfəri, yəni 78,35 %-i müvəffəq qiymətlər almışlar. Məktəbi bitirən məzunlardan 404 nəfəri ali məktəblərə qəbul olunmaq üçün sənəd vermiş, onlardan 206 nəfəri, yəni 51%-i ali məktəblərə qəbul olunmuşlar. Ötən illərdəki məzunlarla birlikdə bu il məktəblərimizi bitirən 296 nəfər ali məktəblərə, 42 nəfər isə orta ixtisas məktəblərinə qəbul olunmuşlar. Builki imtahanlarda 32 nəfər məzun 500-dən, 9 nəfər məzun isə 600-dən yuxarı bal toplamışdır. Çıraqlı kənd tam orta məktəbinin məzunu Babayev Samir Mübariz oğlu 681 bal toplayaraq Azərbaycan Tibb Universitetinin müalicə işi fakültəsinə qəbul olunmuş və Prezident təqaüdünə layiq görülmüşdür.

Sonra Azərbaycan Texniki Universitetinin kafedra müdiri, professor Şikar Qasımov, BDU-nun tətbiqi riyaziyyat və kibernetika fakültəsinin professoru Knyaz Məmmədov, ATU-nun professoru, stomatologiya fakültəsinin dekanı Zöhrab Qarayev, fizika-riyaziyyat elmləri doktoru, İqtisad Universitetinin professoru Mustafa Qarayev, “Azərbaycan Hava Yolları” Qapalı Səhmdar Cəmiyyətinin Respublika Komitəsinin sədri Bəkir Yusifov, Azərbaycan Texniki Universitetinin informasiya texnologiyaları və proqramlaşdırma kafedrasının müdiri, dosent Zəfər Cəfərov, Azərbaycan Dövlət Pedaqoji Universitetinin məktəbəqədər pedaqogika və metodika kafedrasının müdiri, pedaqoji elmlər doktoru, professor Müseyib İlyasov, Topçubaşov adına Elmi Cərrahlıq Mərkəzinin şöbə müdiri, tibb elmləri doktoru İlham Kazımov, “Ronayı” Kürd Mədəniyyət Mərkəzinin sədri Fəxrəddin Paşayev, tarix elmləri doktoru, Laçın Tarix Diyarşünaslıq Muzeyinin direktoru Solmaz Məhərrəmova və başqaları çıxış edərək səmimi duyğularını tələbələrlə bölüşdülər, onlara təhsildə və həyatda müvəffəqiyyətlər arzuladılar.

Prezident təqaüdçüsü Samir Babayev bu il ən yüksək balla ali məktəblərə qəbul olunan laçınlı gənclər adından onlara göstərilən diqqət və qayğıya görə minnətdarlığını ifadə edərək müstəqil Azərbaycanın parlaq gələcəyinin qurulmasında öz əməklərini əsirgəməyəcəklərini söylədi.

Tədbirin sonunda qəbul imtahanlarında yüksək nəticə göstərmiş tələbələrə Laçın Rayon İcra Hakimiyyəti tərəfindən “Notebook” və qiymətli hədiyyələr təqdim olundu.

**MÜSAHİBƏ**

***Müsahibimiz peşəkar jurnalist, şair-publisist, Laçınımızın dəyərli ziyalısı Elman Mirzəyevdir (Elman Elsevər).***

## LAÇINIM, MƏN SƏNƏ QAYIDACAĞAM

– **Elman müəllim, 65 yaşın astanasında özünüzü necə hiss edirsiniz?**

– Laçında olsaydıq çox yaxşı hiss edərdim, çox. Laçınsız lap Laçındakından nə qədər yaxşı dolana bilsək də, sevincimizdə bir natamamlıq var. Vətən həsrətiylə, yurd həsrətiylə yaşayan insan nətər olar, hansı hissləri keçirər? Mən də o hisslərlə yaşayıram.

– **Gəlin bir anlığa uşaqlıq illərinə səyahət edək.**

– Məni I sinfə atam apardı. Şəkil müəllimənin sinfinə. Allah ölənlərinizə rəhmət eləsin, indi haqq dünyasındadır. Sənədlərimə baxdılar. Yaşım düşmədi. O vaxt məktəbə 7 yaşda qəbul edirdilər. Mənim isə 6 yaşım vardı. Amma əlifbanı, hesabı bilirdim. Malıbəy kəndində müəllim işləyən dayım məni aparmışdı yanına. 5 yaşımda orada 6 ay I sinifdə oxumuşdum. Şəkil müəllimə məni sinfə qəbul etməyəndə başladım ağlamağa ki, oxuyacam.

Atamla qayıtdıq evə. Səhərisi anam məni gətirdi Humay müəllimənin sinfinə. O, anama da dərs demişdi. Mən qıraqda dayanmışdım, söhbətlərini eşidirdim. Razılaşdılar ki, hələlik sinifdə oturum. Onsuz da bir müddətdən sonra gəlməyəcəm. Sinifdə uşaqların qabiliyyətini yoxlamaq üçün danışdırdılar. Cavablarım xoşlarına gəldi. Beləcə Humay müəllimənin sinfində oxudum. O zaman ibtidai siniflər keçmiş Laçın Pedaqoji Məktəbinin binasında yerləşirdi, sonralar həmin binanı muzey eləmişdilər.

– **Orta məktəb illəri yadınızda necə qalıb? Daha çox nəyi və kimləri xatırlayırsınız?**

– Sinfimiz “a” sinfi idi və bu “a” sinfində biz üç nəfər dostluq edirdik: Malik – sonralar şair kimi tanındı (Malik Fərrux), Tahir – indiki Neft Akademiyasına qəbul olundu və mən. Çox nadinc idik.

Mənə Kamran Alışanov dərs deyibdi, onu çox hörmətlə xatırlayıram. Rəhim Bayramov, çox gözəl bir insan idi.

Əli Məhərrəmov bizə tarixdən dərs deyirdi, o həm də məktəbin direktoru idi. Həmin illərdə imtahana çox ciddi hazırlaşırdıq. İmtahanın gedişində müəllimlər əlavə suallar verirdilər. Xasay Cabbarovun mənə verdiyi sual indiyəcən yadımdadır. Xatırladım ki, Xasay müəllim mənə dərs deməsə də, ədəbiyyat müəllimi kimi şeirlərimə baxardı. Bir şeirimdə dəyişiklik etmiş, maraqlı nəsə alınmışdı. İndi hörmətlə yad edirəm. Hə, onu deyirdim axı. İmtahanda komissiya üzvü kimi əyləşən Xasay müəllim soruşdu ki, insan

üçün dərk olunmayan nə var? Dedim ki, insan üçün dərk olunmayan heç nə yoxdur. “Bəs insan üçün dərk olunmamış nə var”? Əvvəlcə çaşdım, istədim deyəm ki, eyni sualdı da. Bir anın içində səhvimi düzəltdim: “İnsan üçün dərk olunmamış çox şey var. Məsələn ay, yupiter, qalaktika. Bunlar hələ tam dərk olunmayıb”. “Bəs insan üçün dərk olunmayan heç nə yoxdursa, onlar niyə dərk olunmur”? – “Şüur daim inkişafdadır, inkişaf etdikcə onlar da dərk olunacaq”. Cavabım müəllimi razı salmışdı.



Şəfiqə Baxışovanın direktor işlədiyi dövrdə riyaziyyatdan necə imtahan verdiyim də heç yadımdan çıxmır. Səhv etmirəmsə, IX sinifdə oxuyurduq. İmtahanı Rəhim müəllim, Ələsgər müəllim, bir də Balay müəllim götürürdülər. İmtahandan bir gün qabaq evdə bacım Elmiradan soruşmuşdum ki, mənə neçənci bilet düşəcək? Demişdi: – 7-ci bilet. Sinifdə bir qız da 7-ci biletin düşəcəyini demişdi. İmtahanda 7-ci bilet düşəndə qeyri-ixtiyari gülümsündüm. Rəhim müəllim dedi ki, nəyə güldün? Sizə söylədiklərimi deyəndə Balay müəllim başqa bilet çəkməyimi tələb etdi. Ayrı bir bilet çəkib danışdım. Dedilər başqasını çək, yaxşı danışmadın. 3 bilet çəkdirdilər. Sonra da dedilər ki, “3” alırsan. Ağlaya-ağlaya getdim direktorun otağına. Şəfiqə müəllimə mənə gözləməyi tapşırıb özü imtahan otağına girdi. Bir az sonra oradan gülə-gülə çıxdı: – “5” yazıblar, səninlə zarafat ediblər, – dedi.

Ədəbiyyat müəllimim Marış müəllimə olub – Marış Əliyeva. Çox böyük məhəbbətlə xatırlayıram. Ələsgər müəllim həddindən artıq tələbkarlığı ilə seçilirdi. Bir solaxayı şilləsi də vardı. İndi düşünürəm ki, o cür tələbkarlığın nəticəsidir ki, bütün sinif yoldaşlarım demək olar ki, ali təhsil aldılar. Ən

azı orta ixtisas məktəblərini bitirdilər. Ancaq 2-3 qız ailə qurduqlarına görə təhsillərini davam etdirmədilər. Səxavət Yevlaxda su idarəsinin rəisi oldu. Musa indi qaçqınkomda şöbə müdiridir. Oğuldərədən İsmayıl ali təhsil alıb kənd sovetinin katibi işləyirdi. Sultan müəllimin bacısı qızı Dilarə Xarici Dillər İnstitutunu fransız dili ixtisası üzrə bitirmişdi. Əli Kərimov hesablama idarəsinin baş mühasibi oldu. Vəfa, Zəhra, Ulduzə, Əlövsət, Ədalət, Asif, Nüşabə, Nigar, Qoşasudan Çingiz ali təhsil aldılar. Səriyyə texnikum qurtardı. Alxaslıdan Vladimir Sumqayıt Polis İdarəsinin rəis müavini, Bakı şəhər Baş Polis İdarəsinin Cinayət-Axtarış İdarəsinin rəis müavini işlədi. Bir müddət Odessada hüquq-mühafizə orqanlarında da çalışdı.

Yaxın dostum Malik Fərrux mənim üçün ən əziz bir adam idi. Təəssüf ki, sonralar əlaqələrimiz azalmışdı. Onun ölüm xəbərini də gec eşitdim. Böyük sarsıntı keçirtdim. Vahid də Rusiyada rəhmətə gedib. Tahir bir rus qızı ilə evlənib getmişdi. Görüşə bilməmişik. Salah Mingəçevirdə yaşayırdı. Bir-iki dəfə Mingəçevirə gedib soraqladım. Dedilər harasa gedibdi, tapa bilmədim. Maarif şöbəsində anbardar işləyən Ramazan kişinin oğlu idi, Politexnik İnstitutunu bitirmişdi.

– **Sizi jurnalistikaya gətirən özəl bir səbəb vardımı? Seçiminizə qarşı çıxan olmadı ki?**

– Mən uşaq olanda Həzi əmim (Həzi Həsənov) 20 il raykom katibi işləmişdi. Oradan çıxandan sonra mədəniyyət şöbəsinə rəhbərlik edirdi.

O vaxt mədəniyyət şöbəsinin nəzdində fəaliyyət göstərən pionerlər evinin uşaqların formalaşmasında, peşə seçməsində, dünyagörüşlərinin inkişafında böyük rolu vardı.

Həzi əmim pionerlər evinin müdiri Kərim Heydərova məni təqdim edib bildirmişdi ki, bu uşağın ədəbiyyata marağı var, bununla məşğul ol. Mən klubda keçirilən rayon səviyyəli tədbirlərin sonunda göstərilən bədii hissələrdə Kommunist partiyasını təbliğ edən şeirləri əzbərdən söyləyərdim. Şeirə həvəsim getdikcə güclənirdi.

İlk şeirimi II sinifdə yazmışam. Pioner baş dəstə rəhbəri Fənar müəllimə məni pionerlərə şeir oxumağa aparırdı. Malik də şeir yazırdı. Biz yazdıqlarımızı bir-birimizə oxuyurduq. Məndə şeirə böyük maraq vardı. O zaman “Sovet Kürdüstanı” qəzetini ləğv etmişdilər. Laçın, Qubadlı, Zəngilan rayonlarını əhatə edən “Kənd həyatı” qəzeti çıxırdı. Şeirimi həmin qəzetə göndərmişdim. Mənə məktub gəldi. Tərifləyirdilər, əməkdaşlığa dəvət edirdilər. Məktubu qəzetin əməkdaşı Ərşad Əzimov imzalamışdı, məqalələr yazmağımı məsləhət görürdü.

Bir gün bankın yanında qohumumuz İmran əmi əlində qəzet məni yanına çağırdı – şeirin çıxıb – dedi. Həmin gün sevincimdən elə hey qanadlanıb uçmaq istəyirdim...

Məni jurnalistikaya şeirə olan maraq gətirdi.

Maliklə mən jurnalistika fakültəsinə sənəd verdik. Birinci il iki “5” aldım, bir “4”, bir “3”. Mənə bir kağız verdilər ki, həqiqətən bu qiymətləri almışam, ancaq qəbul etmədilər, “konkurs”a saldılar. İkinci il eyni qiymətləri alsam da müsabiqədən keçdim. Özü də ikinci idim, məndən yüksək bal toplayan Nəzakət adlı bir qız oldu. O vaxt jurnalistikaya qəbul çox çətin idi. Başqa fakültələrə 50-100, jurnalistakaya isə cəmi 25 nəfərlik yer ayrılırdı. Hətta deyirdilər elə il olmuşdu ki, dörd “5” alanlar belə “konkurs”a düşmüşdülər.

Ədəbiyyatdan şifahi imtahan verəndə müəllim mənə “4” yazdı. Bütün suallara cavab vermişdim. Yadımdadır, biletimə Süleyman Rüstəmin “Ana və poçtalyon” şeiri düşmüşdü. Azərbaycan dilindən isə “Çıxdı dağ döşünə körpə quzular, Tərlanın səsini əks edir sular”misralarını morfoloji təhlili etmişdim. Mənə “4” yazdıqları üçün etirazımı bildirdim, vərəqi stolun üstünə atıb məsul katibin yanına getdim. O da təəccübləndi – elə bilirəm “2” almısan. Müəllim dedi ki, bundan tələbə olmaz, tərbiyəsizlik edib. Vərəqi başımıza çırpıb. Əslində belə deyildi, vərəqi stolun üstünə atmışdım. Düşünürdüm ki, müəllim məsul katibi görəndə tir-tir əsəcək, ancaq heç halını da pozmadı.

Tarix imtahanını iki kişi müəllim götürürdü. İkisi də ahıl idi, amma biri nisbətən daha yaşlıydı və demək olar ki, çıxanı “kəsirdi”. Fikrimdə elə hesabladım ki, onun qarşısında oturmayım. İki dəfə adımı çəksələr də durmadım. Nətər hesabladımsa, yenə də o qoca müəllimin qarşısına düşdüm. Suallardan biri “Puqaçov üsyanı” idi, danışdım. Başını buladı. Gəlib əsas hissəyə çatanda dedi ki, bu başqa məsələ. Giriş lazım deyil, bax buradan başlamaq lazımdır, bu tarixdir. Nə isə, o biri sualları da cavablandırdım. Fikirləşdim ki, uzağı “3” yazacaq, bayaqdan hamıya “2” yazır. İmtahan vərəqinə qiymət yazıb qələmi üstünə qoydu ki, görünməsin. Özü qol çəkib vərəqi qol çəkmək üçün o biri müəllimə ötürdü. Vərəqi mənə qaytaranda təəccübləndim – “5”? Müəllim sanki düşündüklərimi hiss edərək incə bir eyhamla “Etirazın var?” – dedi.

Fransız dili imtahanında əzbər dediyim şeiri indi də xatırlayıram:

*“Mən gecələr yatağımda uzananda*
*yarpaq kimi üzərimdə kimdi əsən?*
*Kimsə gülümsəyir mən oyananda,*
*Əziz ana, o sənsən.*

*Ana, qocalığın gəlib çatacaq,*
*Bunu düşündükcə döyünür sinəm.*
*O nəvazişi sənə kim qaytaracaq?*
*Əziz ana, o mənəm"*
*(Şeiri əvvəlcə fransızca deyir).*

Müəllimə soruşdu ki, kimin tərcüməsidir. Dedim ki, Elman Elsevərin. "O kimdi, şairdi?", – "Mənəm". "Sənin tərcüməndi? Bizdən çox bilirsən ki". "5" yazdılar. Beləcə universitetə qəbul oldum.

– **Ziyalı ailəsində böyümüsünüz. İndi özünüz də ailə başçısısınız. Atanızla sizin tərbiyə məsələsində hansı oxşar və fərqli cəhətləriniz vardı?**

– Çox böyük fərqlər, eyni zamanda oxşarlıqlar var. Atam hədsiz dərəcədə tələbkar idi. Həm də müharibədə "kantuziya" almışdı, bir az da əsəbiydi. Atam məktəbdə valideynlər şurasının sədri idi. Məni tərifləyib eləsələr gəlib evdə deməzdi. Mən atam kimi tələbkar olmamışam. Oxşar cəhətlər atanın övladlara sevgisidir ki, bu da bütün atalara məxsus keyfiyyətdir.

– **Bir az da ilk əmək fəaliyyətinizdən danışardınız. Əmək kitabçanızda ünvanlar tez-tezmi dəyişib?**

– Orta məktəbin son siniflərində oxuyanda mən dərnək rəhbəriydim. Təqribən 12 manat əmək haqqı alırdım. Birinci il ali məktəbə qəbul olmayanda Laçın internat məktəbində 1 ilə yaxın kitabxanaçı işlədim. Onların heç biri əmək kitabçasına düşməyib. Ondan sonrakı il əyani şöbəyə qəbul oldum.

Bayaq orta məktəbdə imtahan verərkən qarşılaşdığım iki epizodu xoş təəssüratla yada saldım. Universitet illərində də maraqlı hadisələrlə üzləşmişdim. Təəssüflənirəm ki, o xatirələrin bəziləri yaddaşımda ağrılı izlər buraxıb.

...Müəllim qiyabiçilərin kurs işlərinə baxmağı tapşırmışdı. Bir nəfər gəlib "dağlı" ləhcəsində Nüsrət müəllimi soruşdu. Söhbət zamanı məlum oldu ki, Nüsrət müəllim bağ evini ona 3 min manata satmaq istəyir. Dilim dinc durmadı. Dedim mən o bağa heç min manat da vermərəm. Təsadüfən Nüsrət müəllim söhbətin üstünə gəlib çıxdı. Oğlan məni şahid göstərərək Nüsrət müəllimə bağı baha satdığını bildirdi. Alverləri baş tutmadı. Bundan sonra Nüsrət müəllim məni Nurəddin müəllimin (Nurəddin Babayev) yanına apardı. Şirməmməd müəllim (Şirməmməd Hüseynov) də orada idi. "Bağı satmışdım, mərdimazar qoymadı" – deyə şikayətləndi. Şirməmməd müəllimlə Nurəddin müəllim əllərini-əllərinə vurub güldülər: "Aləm eləmisən. Niyə qoymamısan kişi bağını satsın?".

Firuz müəllim II kursda bizə dərs deyirdi. Mən xəstəxanada olanda soruşub ki, "patok"da laçınlı var? Deyiblər ki, var, amma burada yoxdur. Laçın haqqında xoşagəlməz bir ifadə işlədib. Bunu mənə Kamal söyləyəndə çox pi-

simə gəldi. O, auditoriyaya girəndə diplomatımı götürüb nümayişkəranə çıxdım. Mən çıxanda dedi ki, siz dərsdə oturmursunuz? Dedim ki, yox, Laçın barədə filan sözü demisiz? "Elə söz deməmişəm. Biz Sarı Aşığın qəbrini ziyarət elədik. Bizə yaxşı hörmət elədilər". 3 dəfə "əgər demisinizsə qələt eləmisiz" – dedim. Çıxıb gedəndə arxamca qışqırdı ki, mənim dərsimdə oturma, get sənə başqa müəllim ayırsınlar. Onsuz da səndən imtahan götürməyəcəm.

İmtahan vaxtı çatanda başqa tələbələrlə bərabər bilet çəkdim. O da əvvəlcə özünü olub-keçənləri unutmuş kimi göstərdi. Lakin sualları cavablandıranda sanki yuxudan ayıldı: "Axı demişdim ki, səndən imtahan götürməyəcəm". Kafedra müdiri Mir Cəlal müəllimin (Mir Cəlal Paşayev) qəbuluna getmək məcburiyyətində qaldım. Allah ona qəni-qəni rəhmət eləsin. Mənə ədəbiyyat tarixindən dərs demişdi. Çox yaxşı insan idi. Mən şeir deyəndə çox xoşuna gəlirdi. İmtahanda mənə "5" yazmışdı. Filfak bizlə "patok" olurdu. O kafedranın müəllimləri həm bizə, həm də filologiya fakültəsinə dərs deyirdilər.

Hadisəni Mir Cəlal müəllimə danışdım, peşmançılıq hissimi də gizlətmədim. Məni dinləyəndən sonra dedi ki, söyüş söyməmisən ha, üç dəfə ərəb dilində səhv etdiyini demisən. Get mənim adımdan de ki, səndən imtahan götürsün. Firuz müəllim hər dəfə bir bəhanə ilə imtahan götürməkdən yayınırdı. Nəhayət, bir gün hazırlığımı yoxladı. Guya heç nədən xəbəri yoxmuş kimi təəccübləndi: "Bəs mən sizə niyə qiymət yazmamışam"? Sual-cavab edib "4" yazdı.

Nüsrət müəllim isə dirəndi. Yoxlama işini yazmağıma, rus mətbuat tarixindən suallara dolğun cavablar verməyimə baxmayaraq qiymət yazmadı. Qərəzindən əl çəkmədi. Özüm də mübarizədən bezdim, yoruldum. Bircə çıxış yolu qalırdı: ərizə yazıb qiyabi şöbəyə keçmək. Gəldim Nurəddin müəllimin yanına. O mənim "Sovet kəndi"ndə, "Kirpi"də, "Azərbaycan gəncləri"ndə və digər mətbu orqanlarda çıxan yazılarımı oxuyurdu, yaradıcılığıma bələd idi. Adətən diplom işinə "5" yazmırdılar. Amma o, mənə "5" yazmışdı.

Yeri gəlmişkən, deyim ki, atam Xalq Təsərrüfatı İnstitutuna qəbul olunmağımı istəyirdi. Mən jurnalistika fakültəsində "konkurs"a düşəndə bu institut birinci il idi ki, fəaliyyət göstərirdi. Atamın təkidi ilə sənədlərimi ora təqdim etmişdim. Hətta yazılı imtahan da vermişdim. Atam gedəndən sonra sənədlərimi geri istədim. Qız dedi ki, mən sənədləri verə bilmərəm. Məsul katibin yanına getdim. Fəsli idi adı, səhv etmirəmsə. Təkid etdim. Dedi sən "4" almısan, bilirsən "4" almaq üçün nə oyunlardan çıxırlar? İnadkarlığımı görüb acığı tutdu, qıza tapşırdı ki, sənədlərini ver getsin.

Qəbul olanda evdəkilərə deməmişdim. Əlimdə qəbul kağızı evə gələndə İmran əmim də bizdə idi. Soruşdular ki, nətər oldu? İmtahandan kəsil-

diyimi dedim. Bir az keçdi, bunlar kefsizlədilər. Qəbul kağızını İmran əmiyə verdim. Məni qucaqladı: “Ə, bizi dolamısan?”. Qəbul kağızını sevincək hamıya göstərdi.

Bir müddət Maarif nazirliyinin nəşriyyatında korrektor işlədim. O da əmək kitabçama yazılmadı. Laçın Rayon İdman Komitəsinin sədri oldum.

Hərbi xidmətdən sonra Bakıda təsadüfən “Ulduz” jurnalının redaktor müavini Sabir Azərini və Qəşəm Aslanovu gördüm. Qəşəm müəllimi “Azərbaycan gəncləri” qəzetinin redaktoru olanda tanıyırdım. Həm də “Müjdə” dərnəyini aparırdı. Orada şeirlər oxuyurduq, şeirlərimi xoşlayırdı. Məni hərbi formada görəndə zarafatla “podpolkovnik, gəl bura” – dedi. Görüşüb xeyli söhbətləşdik. Söz arası öyrəndim ki, Qəşəm müəllim Şuşanın birinci katibidir. O, mənə Şuşada işləməyi təklif etdi. Razılaşdım. 1 aydan sonra Şuşaya gəlməliydim, hövsələm çatmadı, 23 gündən sonra gəldim. “Şuşa” qəzetinin kənd təsərrüfatı şöbəsində 3 il işlədim.

Sonra Azərbaycan radiosunda işə düzəldim. Məmməd Orucun apardığı “Gülüş axşamı” verilişinə səhnəciklər yazmağa başladım. Onda maaş 90 manat idi. Bir də maaşın yarısı qədər qonorar alırdım. Cəmi 135 manat. Naxçıvanski küçəsində ev kirayələmişdim. Mailə Muradxanlıya belə maaşla işləməyin mümkünsüzlüyünü dedim. O isə ştatda işləməməyimi məsləhət gördü. Mailə xanımın məsləhətinə qulaq asdım. Yüksək qonorar alırdım, amma çox da işləyirdim. Bu da əmək kitabçasına yazılmırmış.

Yay məzuniyyətində Laçına qayıtmışdım. Uşaqları da aparmışdım. Raykomun köməkçisi Şükür Orucov evə zəng vurdu ki, Cabbarov səni görmək istəyir. Cabbarov məni qəbul etdi və rayonda işləməyimi məsləhət bildi. “Laçın” qəzetinin redaktoru Qardaşxan Xəlilovu çağırtdırdı. Eyni vaxtda 3 nəfər – Hüseyn Həsənov, Qafar Aslanov və mən rayon partiya komitəsinin təqdimatı ilə redaksiyada fəaliyyətə başladıq.

Müxtəlif illərdə qəzetin şöbə müdiri, məsul katibi və redaktor müavini vəzifələrində işlədim. Tutduğum vəzifədən asılı olmayaraq qəzetin yaxşı çıxması üçün çox ciddi çalışırdım.

**– Sovet dönəmindəki qəzetçiliklə müasir qəzetçilik arasında fərq böyükdürmü?**

– O vaxt açıq senzura tətbiq edilirdi. Elə məsələlər vardı ki, heç vaxt qəzetdə, mətbuatda getməməliydi. İndi sərbəstlikdir. Amma bu sərbəstliyin də bir həddi olmalıdır. İnsanları təhqir eləmək qətiyyən olmaz. Təəssüf ki, qarayaxdılar, şantajlar baş alıb gedir. Bir də görürsən ki, kuklalar yaradıblar. Hazır mətnləri onların bətnində yerləşdiriblər. Düyməsini basanda başlayırlar burunlarının altındakı ağızlarından havanı korlamağa. Ağızlarına gələni danışırlar. Belə şeylər yolverilməzdir. O vaxt tənqidi yazıya mütləq mü-

nasibət bildirilirdi. Adamlarda mənəviyyat yüksək idi. Bir fakt deyim. Laçında Fazil Abışovu yəqin ki, çoxları tanıyır. Geniş dünyagörüşünə malik, mütaliəni sevən bir adamdı. Yeməkxanada işlədiyi vaxt dedi ki, Elman müəllim, mən həbs olunmağımdan qorxmuram, amma "Toxmaq"a düşməkdən qorxuram. Bu gün isə məşhur olmaq üçün özləri haqqında uydurmalar çap etdirənlər var. Tənqidi yazı gedirdisə, idarə başçısına, prokurorluğa, milisə məktub yazırdıq, tədbir görüb 10 gün müddətində redaksiyaya məlumat vermələrini xahiş edirdik. Bizə cavab göndərilirdi.

Sovet təbliğatı güclü təbliğat idi. Yaxşı cəhətləri də vardı, pis cəhətləri də. Azərbaycanda sovet dövrünün təhsilimizin inkişafında, elektrikləşmədə çox böyük rolu olub. Onları da danmaq olmaz. Amma müstəqillik dövründə daha geniş fəaliyyət imkanları yaradılıb.

– **Gənc jurnalistlərə tövsiyəniz...**

– Tövsiyə edərdim ki, pis işlərdən, sifarişli yazılardan – istər tərif, istərsə tənqid – uzaq olsunlar. Vicdanlarının, ürəklərinin səsini eşitsinlər.



– **Bir az da baba-nəvə münasibətlərindən söhbət açaq.**

– Atam mənim, əstəğfürullah, ikinci Allahım olub. Anam mənim üçün ən əziz adamdı. Evimdə nə vaxt bir məclis olsa, süfrənin başında anam oturur. Mən uşaqları çox istəmişəm həmişə. Uşaqlar da nətərsə məni çox istəyirlər. Nəvə də ki... Çox doğru deyiblər "dövlətdə dəvə, övladda nəvə". Nəvə lap şirin olurmuş. Nəvələrim Fərid, Ayan, Fidan və Aylinin timsalında bütün

körpələrimizə xoşbəxt gələcək diləyirəm. Bu günlərdə bir nəvəm də dünyaya gəlib. Hələ ad qoymamışıq. Adını biz verəcəyik, taleyini Tanrı versin.

**– Poeziya həvəskarları, gənclik illərindən şeirlərinizi əzbər bilən dostlarınız kitabınızın çapını gözləyirlər.**

– 100 şeir toplamışdım ki, kitab kimi çap etdirim. Sonra fikirləşdim ki, o qədər axının içərisindən seçilib çıxmaq çox çətin məsələdir. İndi hamı yazır... Çalışaram ki, kitabımı çap etdirim.

Allah Ələkbər Salahzadəyə rəhmət eləsin. Onun ölüm xəbəri məni çox sarsıtdı. Son vaxtlar xəstələnməyim, təzyiqimin yüksəlməsi o itki ilə bağlı oldu. Ələkbər müəllim hər dəfə görüşəndə deyirdi ki, “Vaxtın hər vaxtı”. Bu ifadə ilə çox sevdiyi eyni adlı şeirimə işarə vururdu. Onun qədər sözə həssas adam görməmişəm. Kitabları var məndə. Bütün avtoqraflarında “Kitablarını səbirsizliklə gözlədiyim Elmana” – yazırdı.

– **Ürəyinizdə gəzdirdiyiniz hansı arzunu oxucularla bölüşmək istərdiniz?**

– Həm ürəyimdə gəzdirdiyim, həm dilimə gətirdiyim ən böyük arzum Laçına qayıtmaqdır. Tək mənim deyil, bütün laçınlıların Laçına qayıtmasıdır. Artıq həyatımın qürub çağını yaşayıram.

**– Müdriklik çağı deyək...**

– Təbii ki, həm də müdriklik çağıdır. Mən o doğma yerlərə qayıtmağımı çox istərdim. Bu istəyin gerçəkləşəcəyinə inamımı “Laçınım, mən sənə qayıdacağam” adlı şeirimdə ifadə etməyə çalışmışam. Ancaq ovqatımın indiki məqamında fikrimin davamı olaraq Ələkbər Salahzadənin ruhuma yaxın olan bir şeirini deyərdim:

*Bu yerlər, dünyaya gəldiyim yerlər,*
*Gəlmişdim, gedirəm,*
*Getməyim gəlmir.*
*İstərəm ömrümdə qazanc bir günü,*
*Yenə də ötürəm, getməyim gəlmir.*

*Dağların havası, suyu ehtiyac,*
*Qulağım da acdır, gözlərim də ac.*
*Bir bulaq başında ağacam, ağac,*
*Kök atıb bitirəm, getməyim gəlmir.*

*Gəlməkdi, bu getmək nədi bilmirəm,*
*Yola düşədüşdə yola gəlmirəm.*
*Gözdən yayınıram, ələ gəlmirəm,*
*Özümdə itirəm, getməyim gəlmir.*

*Gəlirik, gedirik bundan ötrümü,*
*Durub ah çəkimmi, köks ötürümmü?*
*Burda bitirirəm ömür sətrimi,*
*Mən burda bitirəm, getməyim gəlmir.*

Mərhum şair dostum elə mənim də arzularımı ifadə edib. Mən də gedib o bulaqların başında kök atıb bitmək istəyirəm.

**– 3 yaşı tamam olan “Laçın yurdu” jurnalını necə görmək istərdiniz?**

– Müxtəlif janrlarda, ayrı-ayrı rubrikalar altında yazıların getməsi müsbət haldır.

Jurnalın səhifələrində yeni imzaların görünməsi, tarixi araşdırmalara, Laçın toponimlərinə kifayət qədər yer ayrılması və bioqrafik tanıtımlar oxucuda maraq doğuran amillərdir. Üslub xətalarının, korrektə səhvlərinin azlığı işinizə məsuliyyətlə yanaşmanızın nəticəsidir. Tərtibat da normaldır. Üz qabığı üçün şəkillərin seçilməsi, kiçik şəkilaltı mətnlər ilk baxışdan cəlbedici görünür.

Peşəkarlıq baxımdan bəzi qüsurların mövcudluğunu, müəyyən yazılarda səriştəsizliyin nəzərə çarpdığını da inkar edə bilmərik. Hərdən bədii cəhətdən zəif şeirlər də çap edirsiniz. Mənə elə gəlir ki, bu da ədəbiyyat həvəskarlarını ruhdan salmamaq məqsədi daşıyır. Zaman keçdikcə bu nöqsanlar da tədricən aradan qaldırılacaq.

Ən əsası odur ki, üzərinizə çətin, eyni zamanda şərəfli bir missiya götürmüsünüz. Məqsədinizə doğru irəlilədikcə problemləri də, problemlərin həlli yollarını da daha aydın görəcəksiniz.

Düşünürəm ki, dünya ədəbiyyatından tərcümələr vermək jurnalın oxunaqlığını bir qədər də artırar. Yusif Otaylının son nömrələrdə gedən tərcümələri ilə tanışam və bu tərcümələrin əhatə dairəsinin genişlənəcəyinə ümid bəsləyirəm. Qoy oxucular dünya ədəbiyyatından da xəbərdar olsunlar.

Danılmaz həqiqətdir ki, hər hansı bir mətbu orqanın yaşaması ilk növbədə maliyyə yardımından asılıdır. İnanıram ki, təəssübkeş laçınlılar “Laçın yurdu”nun davamlı çıxması üçün maddi və mənəvi köməkliklərini əsirgəməyəcək, jurnala abunə yazılmaqla öz dəstəklərini nümayiş etdirəcəklər.

**Arif MƏMMƏDLİ**

**POEZİYA**

**Elman ELSEVƏR**

### ÇUĞUL

İçiribmi söz alırsan,
söz alıbmı içirirsən?
Ötürüncə qurd üstünə
neçə itdən keçirirsən?

Barı keçi qiymətinə
aldığını satırsanmı?
Qazancın yüksək olan gün
Gecə rahat yatırsanmı?

Qulaqların niyə dikdir,
şəklənməkdən şeşədirmi?
Milli pula pul demirsən,
peşən yaxşı peşədirmi?

Alt qatlarda vurnuxursan,
yaramırmı daha üst qat?
Deyirlər məktəb açmısan,
Şagirdlərin çoxmu, "Ustad"?

**18 dekabr, 1996-cı il**

### ÇİNARQAYA

Laçında
  Qaqıqışlaqda
        qaya vardı –
              Çinarqaya;
əsmə, külək, yaddaşımdan
yıxılıb, sınaar qaya.

A Qaya, çinar Qaya,
Üzü daş, içi nar Qaya.
Andıqca səni, nədən
ürəyim uçunar, Qaya.

Torpaq bilməz daş biləni,
Daş –
        Torpağın baş biləni;
Düzüb asar inci-inci
Kirpik-kirpik yaş giləni.

**1992-ci il, avqust**

### ŞƏHİD

***Milli qəhrəman***
***Oqtay Güləliyevin xatirəsinə***

Deyirsən, çox istəyinə
yetməyə ömrü yetmədi?
Ölümünü ömrünün
üstə ki örtüb getmədi.

Göy üzündə
        torpağının
qalxıb ulduza döndü –
sayəsində nə qədər
Yağı çırağı söndü.

Öyrədirsə yolunu
ölümü öldürməyin,
hər dünyasın dəyişənə
Öldü! – deyib öldürməyin.

Çox da
        çox muradına
çatmağa vaxtı çatmadı.
Ölümün ki ömrünün
üstünə sərib yatmadı...

**oktyabr, 1992**

## PAYIZ

Meşəni nə yaman fikir aparıb,
virusmu yoluxub burda
yarpağa –
səssizcə-səssizcə haray qoparıb,
fırlana-fırlana düşür torpağa.
Əbədi yanmaqçün sönənlər
artır,
qara mərmərlərə dönənlər
artır.
Bu günüm Vaxtımla döşləşib
sönür,
Sönənlər ötdükcə, dünənlər
artır...

**05.07.1998**

## YAĞIŞ KƏSİB

***Anama***

**1.**

Solur orman yarpaq-yarpaq,
bulaqlar suyunu qısır.
Qarsılıb-qovrulur torpaq,
üzüboz buludlar qısır.

Şümşürük oynayar,
ildırım çaxar,
buludlar ağlaşar,çöllər sevinər.
Zəmiyə, tarlaya fərəhlə baxar –
məhsulu bol görən ellər
sevinər.

**2.**

...Yorğun-arğın ayaqların
Qalxıb yorunca yoxuşu,
Dilində qürub edənin
Gözündəndi doğuşu.

**3.**

Səs gedən tezlikdə qüsur,
Çay buğlanır, telefon susur.
Baxmır təzədi, köhnədi,
Sonsuzluq saatı pusur.
Gözünü yol çəkənin
Gözü yol çəkir.
Fikri bəyənmədiyinə
Sözü qol çəkir.

**4.**

Yağış susub, ta küləyin
Qol-budaqla yox işi.
Gözündən qürub edənin
Dilindəndir doğuşu...

**1997-ci il, may**

## RÜŞVƏT

Yetim qız baxışıdır,
Dilənçi qarğışıdır,
Göz yaşı yağışıdır –
Yağar üzüyuxarı.

"Ədalət"dir – zahıdır.
Acgözün allahıdır.
Anaların ahıdır –
Qalxar üzüyuxarı.

Körükdür – göz əridir,
Qadındır – yüz ərlidir.
Ac uşaq gözləridir,
Baxar üzüyuxarı.

Yüksəklikdə lay-laydır,
Şırıltısı layladır.
Bol sulu, lilli çaydır,
Axar üzüyuxarı.

Dağ qızıla bürünüb,
Döşdə daş-qaş sürünür.
Çoban dollar sürünü –
Yığır üzüyuxarı.

## QIZIL ÖKÜZ ƏFSANƏSİ

Vaxt var vaxt od qoruyub,
vaxtı vaxt var od qoruyub.
Vaxt vaxt olub qora uyub,
vaxta vaxt olub qor uyub.
Nə zaman ki, Qızıl öküz öskürüb,
buynuzunda saxladığı
yer tərpənib –
Od püskürüb...
Bir vaxt ordan alov qalxıb,
Lava – od seli axıb,
Qarşısına keçəni
Ağac-ağac, ot-ot yaxıb.
İllər ötüb,
kraterdə ağac bitib –
Bəlkə elə toxumu
göydən enib kraterə,
ya da bir quş dimdiyindən
düşüb, sancılıb yerə.
Yerdən qalxıb, budaq-budaq
Dörd bir yana şaxələnib.
Ensiz yarpaqları üstə elə bil,
ələklə gümüşü nəsə ələnib –
İydə görməmişəm bu ucalıqda,
çiçək görməmişəm çiçəyi iydə.
Sən də qoxla, o ətri,
o çiçəyi sən də iylə.
Hardansa düşüb çalaya,
çuxuru doldurub gözəlliyiylə...
Bir vaxt ordan alov qalxıb.
İllər ötüb.
Ağac bitib kraterdə.
Kraterdə bitən ağac
vulkan ağzında tıxanc...
Nə zaman ki, Qızıl öküz öksürər,
Buynuzunda yer diksinər –
od püskürər...

**iyun, 1989-cu il**

## LAÇINIM, MƏN SƏNƏ QAYIDACAĞAM

Kəməndəmi salıb könlümü saçın –
möhnətin içimi, içimdən otlar;
Soyuq nəğmə deyir Ulduzlar, Laçın,
çimir soyuq nurda Çiçəklər, Otlar...

Bu sazaq hayandan baş aldı gəldi,
sis-çiskin qurğuşun siqlətli, ağır.
Qaragöl gözümə saflıq çilərdi,
Xəzərdən...
gözümə həsrətin yağır.

Yağır sarı-sarı,
yağır şıdırğı,
Həkəri gözümdə dumana dönür.
Sinəmdə alışan inam çırağı
əriyib, sozalıb gümana dönür.

İpək durnalarım köç edib gedir,
bənövşə barmaqlar nə tez büzüşdü.
Ümid yarpaqlarım tökülür bir-bir,
ömrümün Dağsızlıq payızı düşdü...

Yox, yox, ulu Yurdum, ulu Ocağım,
Dağlı qəzəbimi oyadacağam.
Yarıb qaranlığı –
ildırım təki
Mən Sənə,
mən Sənə qayıdacağam!

## BABAM DEYƏRMİŞ:
## "OĞUL, OSMANLILAR OLMASAYDI..."

...İri gövdəli palıd ağaclarının arasından süzülən günəş şüaları səhərin sərin mehinin oxşayaraq oynatdığı yaşıl yarpaqların üzərində rəqs edərək işıldayır, budaqdan-budağa atlanan quşların cəhcəhi, yerdəki otların üzərində uçuşan arıların, böcəklərin vızıltısı heç bir bəstəkarın yaza bilməyəcəyi bir azadlıq simfoniyası yaradırdı... Hərdən iki balaca əl gah ağacların üzərindəki, gah da yerdəki quru budaqları qırır, bir az aralı daşıyaraq toplayırdı. Bəzən qırılmış budaqların iti ucları yerə bataraq torpağın üzərində şırım açır, sanki yol çəkirdi. Bu, odun toplayan 12-13 yaşlı yeniyetmənin xoşuna gəlir, budaqları daha bərkdən yerə basırdı ki, torpaqda daha dərin şırım açılsın. Belə "yol çəkilişlərindən" birində uşağın gözünə bir neçə dəmir parçası sataşdı... Cəld onları əlinə götürüb maraqla o tərəf-bu tərəfə çevirdi. Bu, paslanıb yeyilmiş güllə gilizləri idi. Yeri qazdıqca onlardan yenə çıxırdı... Axşam həmin gilizləri atasına göstərən uşaq onların hansı dövrdən qala biləcəyi ilə maraqlandı...




Həmişə 1918-1920-ci illərdən, yaşlıların təbirincə desək, erməni-müsəlman davasından danışanda o "beşaçılan" gilizləri, onların tapıldığı yer və atamın o barədə söhbəti yadıma düşür. Həmin 10-12 yaşlı uşaq mən, o gilizlərin tapıldığı məkan isə kəndimizin yaxınlığında "Cırranın yalı" adlanan ən

hündür yerlərdən biri idi. Bu, Kiçik Qafqazın uca zirvələrindən olan Kirsin 5-6 kilometrliyində, hazırda erməni işğalındakı Laçının Ağanus kəndində idi...

O zaman bizə hələ müsəlman, türk olduğumuzu anladan yox idi. Ancaq atamın söhbətlərindən çox şeyləri öyrəndim. Məlum oldu ki, həmin gilizlər XX əsrin əvvəlində babalarımızın bizə yardıma gəlmiş osmanlı türkləri ilə çiyin-çiyinə ermənilərlə apardığı savaşlardan qalıb. Bir az böyüyəndən sonra həmin yerlərə daha diqqətlə baxmışdım. Eni təxminən 1-1,5 metr olan bu "zolaqlar" başqa tərəflərə nisbətən xeyli çökək idi və sanki bir xətlə dağ beli boyu on metrlərlə uzanırdı. Çökəklərin nisbətən hündür qarşı tərəflərində isə iri daş parçalarının çıxıntıları görünürdü. Gilizlər daha çox bu çökəklərin arxa tərəfindən tapılırdı. Artıq bu qənaətə gəlmişdim ki, bura əsrin əvvəlində erməni quldurlarına qarşı vuruşmuş müsəlman döyüşçülərinin səngəri olub...

Atam da öz babasından eşitdiklərini danışardı. Ulu babam Əbdüləli bəy 120 ilə yaxın ömür sürmüşdü. Savad almasa da, sinədəftər olan bu müdrik kişidən şirin söhbətləri, bayatıları ilə yanaşı, bir neçə əşya da xatirə qalmışdı. Uşaq ikən ən çox diqqətimi cəlb edən babamın quzu dərisindən olan buxara papağı, böyük nağarası və bir də iri polad xəncəri idi... Həmin xəncərlə o, məşhur el qəhrəmanı Sultan bəyin dəstələrindəki döyüşlərdə neçə yağı başı kəsmişdi. Əbdüləli bəy 1914-cü ildə könüllü olaraq I Cahan Savaşına yollanmış azsaylı Azərbaycan türklərindən biri idi. "Dikiy (vəhşi) diviziya" adlanan məşhur müsəlman hərbi hissəsinin tərkibindəki süvari alayında Polşanın Krakov quberniyasına qədər gedən döyüşlərdə iştirak etmişdi. 1917-ci ildə yaralandıqdan sonra Vətənə qayıtmış və sonradan bizə yardıma gəlmiş Osmanlı ordusu ilə birgə hərəkət edən Sultan bəyin dəstələrində Andronikin erməni quldur birləşmələrinə qarşı döyüşlərdə iştirak etmişdi... 16-17 yaşlarımdan bəri atamın babam haqqında danışdıqlarından daha çox bu yadımdadır: "Oğul, babam deyərdi ki, 1918-də osmanlılarla Sultan bəy olmasaydı, buralar çoxdan ermənilərin idi..." Ömrünün son günlərinə qədər Əbdüləli babam tez-tez hündür papağını başına qoyar, polad xəncərini kəmərinə taxar və nağarasını vurub bütün kəndi başına yığan uca səsi, xoş avazıyla oxuyarmış: "Ənvər paşa (yaxud Nuru Paşa – S.L.), səni görüm min yaşa!.."

O zamanlar Sovet dövlətinin "qardaşlıq" təbliğatı ermənilərin düşmənçiliyini bizlərə unutdurmuşdu və biz Sultan bəyin, Ənvər paşanın kim olduğunu da bilmirdik. Qonşu Qaladərəsi və Kirov kəndlərindəki "kirvə" er-

mənilər isə Andronikin, Njdenin kim olduğunu bilir və torpaqlarımızın növbəti işğalı üçün gizli maddi və ideoloji hazırlıq görürmüşlər... Amma o zamandan kimliklərini tam dərk etməsəm də, qeyri-iradi Ənvər paşa, Nuru paşa və Sultan bəy adlarına qarşı bir məhəbbət yaranmışdı qəlbimdə...

Bayaq haqqında bəhs etdiyim səngərlərə və gilizlərə böyüdükcə kəndimizin ətrafındakı dağların həm zirvələrində, həm də ətəklərində rast gəlirdim. Təəssüf ki, biz o səngərlərə toparlanıb torpaqlarımızı gərəyincə qoruya bilmədik... O torpaqları, o Qafqaz dağlarını ki, vaxtilə babalarımız Osmanlı türk əsgərləri ilə birgə öz canları bahasına azad edib, qoruyub bizlərə əmanət qoymuşdular. Ermənilərlə sovet "qardaşlığı" bizlərə əsl qardaşlarımızı unutdurmuşdu...

Yalnız 1988-1994-cü illərdə torpaqlarımıza qarşı növbəti erməni təcavüzü dövründə bir çox həqiqətləri anlaya bildik. Öyrəndik ki, XX əsrin əvvəlində cəmi 23 ay yaşamış, Şərqdə ilk müstəqil demokratik cümhuriyyət olan Xalq Cümhuriyyətimiz olub. Və həmin dövləti Məhəmməd Əmin Rəsulzadə, Fətəli xan Xoyski və başqaları başda olmaqla babalarımızın hansı əziyyətlər, mərhumiyyətlər hesabına və kimlərin köməyi ilə qurduqlarını da anladıq. Onda Əbdüləli babamın nədən tez-tez "osmanlılar gəlməsəydi..." dediyini də başa düşdüm. Onu da öyrəndim ki, bayaqdan bəhs etdiyimiz səngərlər yalnız doğulduğum Kiçik Qafqaz dağlarında deyil, Güney Azərbaycandan, Naxçıvandan, Zəngəzurdan, Qarabağdan üzü bəri, Batumdan, Borçalıdan Dərbəndədək bütün Qafqaz elləri boyu qazılmış və türk-müsəlman xalqlarını təcavüzdən, zülmdən qoruyan bir sipərə çevrilmişdi. Həmin səngərləri qazan oğullar öz yenilməz ruhları, canları ilə haqsızlığın, şərin önündə bir basılmaz səngərə dönmüşdülər... Yeri gəlmişkən, həmin səngər yerlərində qazıntılar aparıb o savaşlara aid əşyaların qalıqlarını toplayaraq ayrıca bir Qafqaz İslam Ordusu muzeyi yaratmaq da qarşımızda duran vəzifələrdən biridir...

Qafqaz İslam Ordusu barədə çox araşdırmalar aparılıb, çox kitablar nəşr edilib. Odur ki, faktlara və xronologiyaya çox yer vermədən bu qardaş ordusunun Azərbaycanın və bütövlükdə Qafqazdakı türk, müsəlman xalqlarının taleyindəki rolu barədə öz düşüncələrimi bölüşmək istərdim.

Hər tərəfdən kafir həmlələri ilə üz-üzə qalmış 500 illik tarixə malik möhtəşəm Osmanlı dövlətinin özünün taleyi üçün çox kritik bir məqamda yaradılmış bu ölçücə çox da böyük olmayan, amma ruhca nəhəng hərbi qurum əsl islam sevgisinin, türk qardaşlığının, yardımsevərliyinin bariz nümunəsi olmuşdu...

1918-ci ilin fevralından bəri hərbiyə naziri Ənvər paşanın təşəbbüsləri ilə bünövrəsi qoyulmuş Qafqaz İslam Ordusunun əsas vəzifəsi yalnız Azərbaycanda deyil, bütün Qafqaz boyu türk, müsəlman xalqlarına qarşı erməni-rus qətliamını durdurmaq və bölgəni yalnız Rusiya deyil, həm də ingilis, alman imperiyalarının caynağından qurtarmaq idi. Birinci Dünya savaşının qızğın çağında – Osmanlının "Antanta" dövlətləri ilə mübarizədə bir çox mövqeləri əldən verdiyi bir məqamda bu cür addım atmaq böyük risk və cəsarət tələb edirdi. Ancaq Qafqazdakı müsəlmanların namus-qeyrətini özününkü bilən Osmanlı sultanlığı və hərbi komandanlığı bu riskə getdi. Və əsasən osmanlı, sonra isə Azərbaycan və Dağıstan müsəlmanlarından təşkil edilmiş cəmi 20 minə yaxın döyüşçüsü olan Qafqaz İslam Ordusu qısa müddətdə dünya hərb tarixində nadir rast gəlinən çevik əməliyyatlar keçirərək bir neçə ay ərzində Naxçıvandan, Urmu gölündən Bakıyadək, Borçalıdan Dərbəndədək bir sıra Azərbaycan, müsəlman torpaqlarını erməni-rus və ingilis birləşmələrinin caynağından azad edə bildi.

Nuru paşa başda olmaqla Osmanlı əsgərlərinin 25 may 1918-ci ildə Gəncəyə daxil olması zamanı şəhər sakinləri tərəfindən sevinclə qarşılanması tariximizin unudulmaz ilhamverici səhnələrindəndir. Məhz bundan sonra başda M.Rəsulzadə, F.Xoyski olmaqla Tiflisdə qərar tutmuş aydınlarımız Azərbaycan Xalq Cümhuriyyətini elan etmək cəsarətini qazandılar. Və 1918-ci ilin martından bəri yalnız Bakıda, Şamaxıda, Qubada, Qarabağda və s. 50 minə yaxın müsəlmanın amansız vəhşiliklərlə qətli ilə nəticələnmiş erməni-bolşevik soyqırımından böyük sarsıntı içərisində olan Azərbaycan xalqı bu iki şad xəbərdən sonra ayağa qalxıb düşmənə müqavimət göstərmək üçün özündə güc tapa bildi. Bundan sonra Nuru paşa, Xəlil paşa və Əliağa Şıxlinskinin başçılığı ilə Qafqaz İslam Ordusunun Gəncə, Göyçay, Qaraməryəm, Kürdəmir, Ağdaş, Ağsu, Şamaxı və nəhayət, Bakının azad edilməsi üçün apardığı zəfər döyüşlərini əlimizdə olan detallarına qədər çözələdikcə damarlarında türk, müsəlman qanı axan hər kəsin qəlbi həyəcanla döyünür, Azərbaycan-Türkiyə qardaşlığının sarsılmazlığına, bu qardaşlığın tezliklə erməni əlində olan torpaqlarımızın azad edilməsi üçün yeni zəfərlərə imza atacağına inam yaranır...

Beləliklə, Qafqaz İslam Ordusunun 1918-ci ilin mayından noyabrınadək apardığı zəfər yürüşü Osmanlı dövlətinin süqut dövrünü yaşamasına baxmayaraq Mustafa Kamal paşanın bir ildən sonra təməlini qoyacağı və nəticədə yeni Türkiyə Cümhuriyyətini yaradacağı Azadlıq hərəkatına 1915-ci ildə minlərlə Azərbaycan türkünün də şəhid olduğu Çanaqqala savaşından sonra

ruh yüksəkliyi verə biləcək ən böyük amillərdən biri kimi tarixdə qaldı. Eyni zamanda Azərbaycanın müstəqil ordusunun təməlinin qoyulmasına səbəb olan bu amil gənc müstəqil dövləti və xalqı Qarabağda, Zəngəzurda erməni işğalçılarına qarşı səfərbər olmaq üçün də ruhlandırdı. 15 sentyabr 1918-ci ildə Bakının erməni-bolşevik birləşmələrindən azad edilməsi, yalnız Bakının deyil, əslində o dövr üçün bütövlükdə Azərbaycanın Qurtuluş Günü kimi tarixə həkk olundu. Çünki Bakı olmayacağı təqdirdə Xalq Cümhuriyyəti Gəncədə də duruş gətirə bilməz, Şaumyanın başçılıq etdiyi kifayət qədər silah-sursata malik erməni-rus-ingilis birləşmələri qarşısında süquta uğrayardı. Bundan əlavə, Şimali Qafqazda, Dağıstanda aparılan əməliyyatlar da öz tarixi bəhrəsini verdi. Zənnimcə, Qafqaz İslam Ordusunun bu bölgəyə gəlməyəcəyi halda, bu gün Dağıstan, çeçen, inquş, kabardin, çərkəz və s. xalqları bugünkü Rusiya daxilində milli muxtariyyətə belə nail ola bilməyəcəkdilər... Bu islam-türk mücahidlərinin ordusu Azərbaycanın ürəyini – Bakını xilas etməklə bütövlükdə Qafqazı xristianlaşmaqdan, kosmopolitləşməkdən xilas etdi. Və bu gün biz güllü-çiçəkli dənizkənarı bulvarda azad şəkildə gəzib Bakını ləzzətlə seyr edərkən aldığımız hər nəfəsdə 95 il öncə Qafqazın uca zirvələrindən üzü bəri Bayıl, Biləcəri, Əhmədli və s. yamaclarındakı səngərlərdə canını qurban vermiş, qanını axıtmış Qafqaz İslam Ordusu döyüşçülərini böyük bir sevgi ilə anmalı və bunu övladlarımıza, nəvələrimizə də anlatmalıyıq. Necə ki, babalarımız bizlərə anladardı: “Oğul, osmanlılar olmasaydı...”



**Sultan LAÇIN**

POEZİYA

Vəliş ZİRVƏLİ



**XƏYALLAR KƏFƏNDİMİ?**

Yenə könlüm açılıb,
Minmişəm səməndimi.
Dağlar başı dumandı,
Düzlər yasəməndimi?

Buludlar maya-maya,
Buz bulaq axır çaya.
Atıram lal qayaya
Öz xəyal kəməndimi.

Həmin bağça, həmin bağ,
Açılıb budaq-budaq.
Güvənc yerim məğrur dağ,
Beşiyim çəməndimi?

"Pir"də çağlayır ümid,
O "Çalbayır", o "Yal yurd".
Görən dəyişibmi yurd,
Ya elə həməndimi?

Bu, dərdin çoxu imiş,
Bir özgə qoxu imiş.
Ayıldım, yuxu imiş,
Görəmmədim kəndimi.

Mat qalmışam bu işə,
Yanılıram həmişə.
Qürbət eldə Vəlişə
Xəyallar kəfəndimi?

**ƏMƏLİNDƏN XƏBƏRDARAM**

Qoca dünya, doğru gərdiş
Görən yoxdu hələ səndə.
Neçə-neçə süleymanlar
Bağlamayıb şələ səndə.

Qəm göndərib pərdə-pərdə,
Gülürsən verdiyin dərdə.
Tələ qurdun neçə mərdə,
Yanıb döndü külə səndə.

Bu nə yara, bu nə sitəm,
Gileylidi səndən aləm.
Yandı Əsli, yandı Kərəm,
Qan ağladı Lələ səndə.

Əməlindən xəbərdaram,
Sızıldayır köhnə yaram.
Qəmdən məstəm, inanmıram
Xoş günlərim gələ məndə.

Əjdahasan insan udan,
Ayılmırsan bu uyğudan.
Vəliş gəlməz o dünyadan
Arxasınca mələsən də.

### ÇAŞBAŞ KİMİYƏM

Mən Vətənsiz – yuvasından
Perik düşən quş kimiyəm.
Dağ başından dərələrə
Qopub gələn daş kimiyəm.

Yox ümidim, yox nəfəsim,
Donub nitqim, batıb səsim.
Öləziyib od nəfəsim,
Buz nəfəsli qış kimiyəm.

Göynəyirəm günahımdan,
Asılmışam öz ahımdan.
Xəbərim yox sabahımdan,
Bir azca çaşbaş kimiyəm.

Vəliş, getdi Laçın, Şuşam,
Qəmin əlindən bihuşam.
Qürbətə atılan daşam,
Guya vətəndaş kimiyəm.

### ÇATMADI

Min cür görəcəklər gördü gözlərim,
Hansı görəcəyin, görkün çatmadı.
Yudu sevincini gözünün yaşı,
Bəlkə də dözməyə təmkin çatmadı.

Sevgimə xəyanət, özümə yardım
Etdilər, ah çəkdim, haray qopardım.
Dərdimi yazmaqçün şair olardım,
Şair olmağıma bir gün çatmadı.

Nadanlar kef çəkib zaman sürdülər,
Verməyib kimsəyə aman sürdülər.
Bizi qürbətlərə yaman sürdülər,
Sürgün edənlərə sürgün çatmadı.

Saldılar yolumu qışa beləcə,
Döndü neçə arzum daşa beləcə.
Vəliş, dedilər ki, yaşa beləcə,
Amma yaşamağa ərkim çatmadı.

**XALQ QƏHRƏMANLARI**

## CAĞAZURLU AĞAMƏMMƏD

1918-1920-ci illərdə Qarabağ dağlıq yaylasında, indiki Laçın rayonu ərazisində erməni quldur dəstələrinə qarşı azəri türklərinin apardığı müharibədə, tarixə "Qara göl" döyüşləri kimi düşmüş bu azadlıq mücadiləsində öz qəhrəmanlığı ilə ad-san qazanmış xalq qəhrəmanlarından biri də Cağazurlu Ağaməmmədir (Ağamməd).

Qara göl döyüşləri əslində XIX əsrin sonu, XX əsrin əvvəllərində formalaşmış Azərbaycan milli burjuaziyasının ən görkəmli nümayəndələrindən biri, öz xalqı qarşısında göstərdiyi xidmətlərə görə Hacı Zeynalabdin Tağıyev, Şəmsi Əsədullayev, Ağamusa Nağıyev, xan qızı Natəvan kimi öz halal zəhmətilə qazandıqları var-dövləti xalqın yolunda sərf edən və onlarla bir sırada dayanan Sultan bəyin bilavasitə rəhbərliyi, təşkilatçılığı və maddi

dəstəyi ilə aparılan partizan müharibəsi idi. Bu müharibədə Sultan bəylə yanaşı onun ən yaxın silahdaşları – Seyid Həmid, Hacılarlı Ağalar, Cağazurlu Ağamməd, Bayandurlu Gülüm, Malıbəyli Zaman və digərləri də xalqımızın azadlıq mücadiləsi tarixinə əsl xalq qəhrəmanları kimi düşmüş, adları qan yaddaşımıza həkk olunmuş, nəinki Azərbaycan xalqının, bütün türk dünyasının qürur duyduğu, fəxr etdiyi şəxsiyyətlərdir.

Çətin dağ şəraitində, keçilməz dərə və aşırımlarda aparılan döyüş əməliyyatları ancaq bu ərazini dəqiq tanıyan, eyni zamanda qorxmaz, igid, doğma torpağın təəssübünü, xalqının, elinin namusunu canından əziz tutan qeyrətli oğullar sayəsində uğurla başa çatdı. Bu döyüşlərdə Cağazurlu Ağammədin göstərdiyi igidliklər, şücaətlər sonralar artıq əfsanələr səviyyəsinə qədər yüksəldi.

Ağaməmməd İmamqulu oğlu Quliyev 1873-cü ildə indiki Laçın rayonunun Cağazur kəndində anadan olmuşdu. Hələ yeniyetməlik və gənc yaşlarından mahir ovçuluğu, qoçaqlığı, qorxmazlığı ilə həmyaşıdlarından fərqlənən Ağaməmməd erməni quldur dəstələri Qarabağa soxulmaq istərkən bir an belə tərəddüd etmədən doğma torpaqların müdafiəsinə qalxmışdı. Onun adı xalq arasında o qədər danışılıb ki, sonradan xalq dilində qısalaraq Ağamməd şəklində tələffüz edilib.

Ağamməd iri, cüssəli bədən quruluşuna, ağır çəkiyə malik olmasına baxmayaraq görünməmiş dərəcədə cəld, qoçaq, yorulmaq bilməyən bir igid olub. Ağammədi hər at götürməzmiş. Hər hansı mənzilə gedərkən Ağamməd ən azı üç at dəyişməli olarmış. Erməni quldur dəstələrinə qarşı müharibədə göstərdiyi igidliklər sayəsində ən ağır döyüşlərdən, mühasirələrdən ağlagəlməz dərəcədə qalib çıxan Ağamməd və onun ən yaxın silahdaşları Seyid Həmid, Hacılarlı Ağalar haqqında sadə xalq kütlələri arasında əfsanə yaranmışdı ki, bəs guya Ağammədin, Seyid Həmidin və Ağaların əyinlərində dəmir libasları və ya Quran ayələri yazılmış geyimləri olduğundan onlara güllə təsir etmir.

Sultan bəydən külli miqdarda silah-sursat və maddi dəstək alan Ağamməd Cağazur kəndinin Gorus istiqamətində, sonralar yerli əhalinin Qarovultəpə adlandırdıqları məntəqədə, Mərkəzdə, Kömür quyusu adlanan yüksəklikdə gözətçi postları yaratmış, indiki Ermənistanın Goruş rayonunun Tex, Gornidzor, Xindzoresk, Daşkənd kəndləri istiqamətində Cağazur kəndinə doğru bütün erməni hücumlarının qarşısını özünün təşkil etdiyi hərbi dəstələrlə almışdı.

Çünki Ağamməd də, Seyid Həmid də, Ağalar da yaxşı bilirdilər ki, Cağazur kəndinin ərazisi nisbətən düzəngah olduğundan ermənilər məhz buradan cəbhəni yarıb Malıbəy, Qarıqışlaq, Zeyvə kəndlərindən keçməklə irə-

liləyə bilərlər. Cəmi bir dəfə Ağamməd Qarabağa – Xosrov bəy Sultanovla görüşə gedərkən ermənilər onun kənddə olmamasından istifadə edib Cağazur kəndinə soxulmuş və kəndi yandırmışdılar. Lakin Ağamməd kəndə qayıdan kimi öz dəstəsi ilə hücuma keçərək erməniləri qovub Gorusa qədər bütün kəndlərdən çıxarmış, həmin kəndləri yandırmış xeyli sayda erməni yağılarını məhv etmişdi. Ona görə də Sultan bəy bir təşkilatçı və rəhbər kimi Cağazur kəndinin əhəmiyyətli mövqeyinə görə buranı daim diqqətdə saxlamış, Ağamməd‌lə tez-tez, demək olar ki, günaşırı görüşmüş, döyüş əməliyyatlarını müzakirə etmişdi. Sultan bəy istər döyüş bölgələrində, istərsə başqa rəsmi məclislərdə həmişə “Mən Ağamməd‌ə özüm qədər inanır, özüm qədər etibar edirəm” deyərmiş.

Cağazurlu Ağamməd‌in şəxsi igidliyi Köhnə Gorus kəndinin şimalında, Qazi gölünün sahilində erməni quldur dəstələri ilə gedən döyüşdə daha bariz şəkildə özünü göstərmişdi. Burada ermənilər Gorus dərəsinə xeyli canlı qüvvə, silah-sursat toplayaraq, Minkənd istiqamətində irəliləmək məqsədilə hücuma keçmişdilər. Lakin Ağamməd özünün ən yaxın silahdaşları – Cağazur kəndindən mahir atıcı Mahmudu, Məmmədi, Məhini, Hacılarlı Ağaları keçidlərdə yerləşdirmiş, eyni zamanda Malıbəy, Hoçaz, Hacılar, Sadınlar, Əhmədli, Minkənd kəndlərindən əli silah tutan bütün əhalini Bayandur dərəsinə və Qurban bulağına toplamış, Seyid Həmid süvari dəstəsi ilə ehtiyatda dayanmış və onlar birlikdə ermənilərin hücumunu gözləmişdilər. Ermənilər hərəkət etməyə başlayarkən gözləmədikləri halda Ağamməd‌in mühasirəsinə düşürlər. Ağamməd şəxsən özü xüsusi təlim görmüş 30 nəfər yağını zərərsizləşdirir, 10 nəfərini isə əsir götürür və təpədən dırnağa qədər silahlanmış ermənilərin ən güclü hesab etdikləri terrorçu birləşməsini darmadağın edir. Qazi gölü döyüşü Qara göl döyüşlərində dönüş nöqtəsi olur. Bundan sonra bütün döyüş əməliyyatları indiki Ermənistanın Gorus və Sisyan rayonlarının ərazisinə keçir.

Ağamməd Zabux dərəsində Andronikin böyük silahlı birləşməsinin darmadağın edilməsində də xüsusi rol oynamışdı. Məlum olduğu kimi, türk düşməni Andronik hiylə ilə Zabux və Abdallar dərələrindən keçməklə Şuşaya, oradan Qarabağa soxularaq Qarabağın aran hissəsini ələ keçirməyi planlaşdırmışdı. Lakin Sultan bəyin müdrikliyi və uşaqgörənliyi sayəsində Andronikin terrorçu quldur dəstəsinin özü Zabux dərəsində tələyə salınaraq məhv edildi. Həmin əməliyyatlarda əsas və həlledici döyüşlərə Ağamməd rəhbərlik etmişdi.

Cağazurlu Ağamməd öz silahdaşları – həmkəndliləri Mahmud, Məhi, Məmməd, İsgəndər, Cəbrayıl, Kərəm, Qəhrəman, Qara Hüseyn, Pənah Heydərov, Həsi, Qaraş, Baloğlan, Cavad, Malıbəyli Zaman, eyni zamanda Hacı-

larlı Ağalar və Seyid Həmidlə birlikdə erməni terrorçu dəstələrinə qarşı diz qatlamadan, gecə-gündüz silahdan ayrılmadan mübarizə aparmışdır. Cağazurlu Ağamməd doğma torpaqlarını düşməndən qorumaqla yanaşı, Zəngəzurun türklər yaşayan kəndlərindən dinc əhalinin qətliamlarının qarşısını almış, minlərlə azəri türklərini erməni terrorçularından xilas etmişdi. Cağazurlu Ağamməd adı ermənilər arasında o qədər ciddi xof yaratmışdı ki, Daşnaksütyun partiyası Ağamməmdin başı üçün xüsusi pul mükafatı ayırmışdı. Lakin onların bütün ciddi-cəhdlərinə baxmayaraq nəinki Ağamməmdi ələ keçirmək və öldürmək niyyətlərinə nail ola bildilər, əksinə Cağazurlu Ağamməd öz silahdaşları ilə birlikdə ermənilərin indiki Laçına, bütün Qarabağa uzanan qara əllərini qırdılar, onlara bu ərazidə elə bir zərbə vurdular ki, uzun illər, Sovet imperiyası dağılana qədər gözlərini götürüb Qarabağa tərəf baxa bilmədilər.

Tarixi reallıq bundan ibarətdir ki, məşhur Sultan bəy, onun silahdaşları – Seyid Həmid, Cağazurlu Ağamməd, Hacılarlı Ağalar, Bayandurlu Gülüm və onların digər silahdaşları ermənilərin türklərsiz Qafqaz, dənizdən dənizə Böyük Ermənistan dövləti yaratmaq ideyasını heç kəsdən əlavə kömək almadan, öz gücləri, öz igidlikləri, cəsarətləri, doğma torpaqlarını öz canlarından əziz tutmaları, namus və qeyrətləri hesabına pozmuşdular. Böyük türk sərkərdəsi Nuru paşanın Bakıda, Qubada, Şirvanda, aran Qarabağda azadlıq yürüşlərini onlar Qarabağın dağlıq hissəsində həyata keçirmişdilər.

Nuru paşanın hərbi dəstələri indiki Laçın rayonu ərazisinə gələrkən Cağazurlu Ağamməd, Seyid Həmid, Hacılarlı Ağalar türk əsgərləri ilə birlikdə Qarabağın dağlıq hissəsinin ermənilərdən təmizlənməsində yaxından iştirak etmişlər. Cağazurlu Ağamməd türk əsgərlərinin əlavə ərzaqla təmin edilməsində böyük işlər görmüşdür.

Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra ermənilər bir çox azadlıq mücahidləri kimi Cağazurlu Ağamməmdi də həbs etdirmək, ondan qisas almaq üçün dəridən-qabıqdan çıxırdılar. Onlar Moskvaya Cağazurlu Ağamməmdin başkəsən, quldur, qaniçən olması, günahsız dinc erməni əhalisini kütləvi şəkildə qətlə yetirməsi haqda ardı-arası kəsilmədən şikayətlər edirlər. Nəhayət onlar 1930-cu ildə öz məqsədlərinə qismən nail olurlar. Ağamməd həbs edilərək Şuşa türməsinə aparılır. Həbs edildikdən sonra Moskvadan onun Şuşa həbsxanasında güllələnməsi haqda rəsmi qərar gəlir. Lakin Şuşa həbsxanasının rəisi igidliyinə, qoçaqlığına görə Ağamməmdin həbsxananın həyətində, erməni dustaqların və erməni milislərinin gözü qarşısında deyil, türmədən kənarda, Topxana meşəsində güllələnməsi barədə göstəriş verir. Deyilənə görə, indiyə qədər də mübhəm qalan səbəblərdən Ağamməd oradan qaçır və kəndə gəlir, ertəsi gün kəndi bir yolluq tərk edir.

Onun sonrakı taleyi barədə heç bir məlumat yoxdur. Ağammədin dörd övladı – bir oğlu və üç qızı olmuşdur. Onun adını daşıyan nəvəsi Ağamməd hal-hazırda Bakıda məskunlaşmışdır. O, da babası kimi 1988-1992-ci illərdə erməni işğalçılarına qarşı müharibədə iştirak etmişdir.

Qədirbilən Laçın camaatı, bütün Qarabağ eli xalqımızın qəhrəman oğlu, azadlıq mücahidi Cağazurlu Ağamrnədi bu gün də qürur və fəxrlə yad edir, onun əziz xatirəsini savaş tariximizin ən müqəddəs əmanəti kimi qoruyub saxlayırlar.

**Nizami İsmayıl SƏFƏVİ,**
**8 may 2013-cü il**

## O KƏND BİZİM KƏNDİMİZDİ

### DAŞLI KƏNDİ



Daşlı yaşayış məntəqəsi XIX əsrdə Zəngəzur qəzasında yaşamış qaraçorlu tayfasının əliyanlı qolunun qışlaq yerlərindən biri olmuşdur. Sonralar həmin tayfaya mənsub olan ailələr, nəsillər bu yeri daimi yaşayış məntəqəsinə çevirmişdilər. Qışlağın yeri daşlı yer oldugu üçün və kənd də həmin daşlı ərazidə salındığına görə, toponimin adı da daşlı adlandırılmışdır. Yerli əhali bəzən kəndin adını Daşdı, Daştı formasında tələffüz edir. Oronimiyada daş termini “filiz”, “qaya”, “daş” mənalarında işlənir. Daşlı

quruluşca düzəltmə toponimdir. O, relyeflə bağlı yaranıb. Toponim Azərbaycan dilində daş sözünə çoxluq mənası ifadə edən “lı” şəkilçisinin qoşulması ilə düzəlmişdir. Daşlı toponiminin arealları Xəzər dənizinin arxipelağında ada, Gədəbəy ərazisində dağ, Şamaxı ərazisində dağ adı kimi keçir. Ölkə xaricində Başqırdıstanda Taşlı, Dağıstanda Daşlıkənd, Moldovada Taşlı, Türkmənistanda Daşlıq və s. (mənbə: 1.ATEL. Bakı, 2007).

Laçının Şəlvə dərəsi 11 kəndi birləşdirirdi. Daşlı bu 11 kənddən biri idi. Laçın rayonunun 50 km qərbində Şəlvə dərəsinin birinci kəndi olan Daşlı o biri kəndlərin giriş qapısı sayılırdı. Daşlı kəndinin əhalisi işğaldan əvvəl 1992-ci ildə 600 nəfər idi. Daşlı kənd icra nümayəndəliyinə 4 inzibati ərazi vahidi daxildi. Bunlar Vəlibəyli, Narışlar, Kaha, Hətəmlər kəndləridir. Heyvandarlıq, arıçılıq, kənd təsərrüfatı əhalinin əsas məşğuliyyəti sayılırdı. Kənddə orta məktəb, kitabxana, kinoqurğu müəssisəsi, mədəniyyət evi, tibb məntəqəsi, rabitə şöbəsi, çörəkxana, təsərrüfat mağazası, ərzaq mağazası vardı.

Gözəlliyi, təbii şəraiti ilə rayonda, bəlkə də respublikada tayı-bərabəri olmayan bir dağ kəndi idi. Kəndi mənbəyi gur bulaqlardan yaranmış Şəlvə çayı iki bərabər hissəyə bölürdü. Hətəmlər kəndindən başqa Şəlvə dərəsinin bütün kəndlərinin sakinləri rayona bu kəndin güneyi ilə çəkilən maşın yolu ilə gedirdilər. Narışlar və Vəlibəyli kəndlərini Daşlı kəndiylə birləşdirən iki maşın körpüsü, bir neçə piyada körpüsü vardı. Quzey deyilən tərəf meşəlik, güney tərəf isə daşlı-qayalı pöhrəlik yer olmuşdur. Ona görə də kəndin adını Daşlı qoyublar. Kənd gündoğandan Qabaq təpə, Qatardaş, cənubdan Üryan, Uzun yal, günbatandan Arxud, Xəlfəli dağı, şimaldan Keşikçi dağı, Hətəmlər yalı dağ silsiləsi arasında yerləşdiyindən alınmaz qalanı xatırladırdı. Kəndin bir giriş, bir çıxış yolu vardı. Tarixən bu kəndə heç kim ürək edib izinsiz gəlib-gedə bilməzdi. Kəndin özünü qoruması üçün sanki təbiət özü Tir tökülən, Tələlər, Şeşə qaya və Qızıl qayanı keşikçi qoymuşdu.

Kəndin əhalisi əsasən bir nəslin törəməsi olmuşdur. Həsənin oğlanları Hüseynxanın, İbrahimxanın, Qələndərin və Cəfərqulunun (Cəfərxanın) Daşlıya gəlmələri təxminən XVIII əsrin əvvəllərinə təsadüf etmişdir. Kəndin əhalisi bu üç qardaşın, Hüseynxanın, İbrahimxanın, Qələndərin nəslindən olanlardır.

Deyilənlərə görə, Şəlvə, Hacıxanlı, Qovuşuq və Kaha kəndləri tarixən Daşlı və digər kəndlərdən əvvəl olmuşdur. Vəlibəyli, Narışlar, Canbəyli kəndləri isə Daşlıdan köçən ailələrin saldıqları kəndlərdir. Daşlı kəndində olan bəzi onomastik vahidlər:

1. Abbasın bulağı
2. Abbasın hasarı
3. Abışın taxtası
4. Ağ yol
5. Ağcaqayın diki
6. Axanın düzü
7. Alçalı barmaq
8. Alıbəyin dolayısı
9. Aslan uçan
10. At damı
11. At ölən
12. Ayıboğan meşəsi
13. Bağırın tapı
14. Balıq uçan göl
15. Bjikin dərəsi
16. Canbəyli
17. Cılğı dərəsi
18. Çeyillik
19. Çırpılıq
20. Çömçə göl
21. Dar dərə
22. Darı yeri
23. Daşlı güney
24. Dərəmədik
25. Dəriz yolu
26. Dik yoxuş
27. Dündül ağacı
28. Eşkə su
29. Ələsgər ölən bulaq
30. Əppək kəsən
31. Əyri tələ
32. Gav
33. Gavır yolu
34. Gen dərə
35. Göy bulaq
36. Göy gav
37. Hasar
38. Hətəmlərin su tökülləni
39. Xanımın yurdu
40. Xaşal ağac
41. Xırman yeri
42. Xırrıx
43. İmpinin yurdu
44. İsmayılın dəyirmanı
45. İtboğan göl
46. Kahanın dərəsi
47. Kolluq
48. Kor bulaq
49. Kortumlu təpə
50. Köhnə yurd
51. Kumanın yolu
52. Qabaq təpə
53. Qabırğa yurdu
54. Qamışlığın yolu
55. Qamışlıq
56. Qanlı palıd
57. Qara kötük
58. Qara şam
59. Qarabulaq
60. Qaranlığın dərəsi
61. Qardaşxan biçən
62. Qarğa meşəsi
63. Qazan göl
64. Qəbiristanlığın düzü
65. Qətil ağacı
66. Qızıl qaya
67. Qoç daşlar
68. Qodu qayası
69. Qulu ölən
70. Quş yuvası
71. Mahmudun şamı
72. Malyaran dərə
73. Maralyan
74. Məşədi əsəd
75. Mirzələrin yurdu
76. Molla Şahverdinin binəsi
77. Muncuqlu düzü
78. Muncuqlu çayı
79. Namazalının suyu
80. Nehrə göl
81. Novlu bulaq
82. Pərixan
83. Rzaların taxtası
84. Sarı toxum
85. Sarı yarğan
86. Sarı yoxuş
87. Səfiyarın biçənəyi
88. Soltanın düzü
89. Şavağatbiçən
90. Şeşə qaya
91. Şəlvə çayı
92. Şırran göl
93. Taxtalar
94. Talalar
95. Tel
96. Tək ağac
97. Tələlər
98. Tirtökülən
99. Talışvurulan
100. Yelli gədik
101. Zeynal biçən
102. Zoğallı dərə

**Hazırladı: Pərviz İSMAYILOV,**
*filologiya üzrə fəlsəfə doktoru*

**POEZİYA**

**Elnur İRƏVANLI**



## HALAL ZƏHMƏTİNLƏ UCADAN UCA

*Bakı şəhəri Xəzər rayonu Buzovna qəsəbəsində yerləşən Əfqan Əliyev adına 125 №li tam orta məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimi, "İlin ən yaxşı müəllimi" müsabiqəsinin qalibi, "Qabaqcıl təhsil işçisi" döş nişanı ilə təltif olunmuş, əməkdar müəllim Zahidova İradə İbad qızının 55 yaşının tamam olması münasibətilə*

Halal zəhmətinlə ucadan uca
Yaşadın bu xanım, xatın ömrünü.
Elm, təhsil verib gül balalara
Uzatdın qohumun, yadın ömrünü.

Zərif bir duyğusan, həzin bir ürək,
Qəlbin tükdən nazik, hisslərin kövrək.
Gələcək nəsillər biləcək örnək
Sənin daşıdığın adın ömrünü.

Elnuram, qəlbimin evində təksən,
Barını dərəsən, hər nəyi əksən.
Ey əziz müəllimim, min dəfə əhsən!
Kişitək yaşadın qadın ömrünü!

**01.09.2013**

## SƏNSİZ BU DÜNYANI NEYNİRƏM

Əgər məndən üz çevirsən,
Sənsiz bu canı neynirəm?
Ömrüm, günüm, bəxtim sənsən,
Sənsiz dünyanı neynirəm?

Uçulsa bu könül damı,
Sönərsə bu sevgi şamı,
Üzümə gələn axşamı,
Açılan danı neynirəm?

Yer göyə, göy yerə çönsün,
Qoyma ümidlərim sönsün.
Donub-donub buza dönsün,
Damarda qanı neynirəm?

Bu eşqi necə dəfn edim,
Bu yolu de kimlə gedim?
Qəlbim olsa didim-didim,
Şöhrəti-şanı neynirəm?

**08.12.2005**

**NOSTALJİ**

## UŞAQLIĞIM



Deyirlər insan həyatının ən qayğısız, ən gözəl dövrüdür uşaqlıq... Maraqlıdır, bu bütün uşaqlaramı şamil edilir?!Nə deyim, bəlkə də... Güllə səsləri... hər gün kimlərinsə ölüm xəbəri... qonşu rayonların faciəsi... valideynlərinin sənin o körpə ürəyinə qorxu hissi salmamaq üçün pıçıltı ilə danışdığı müharibə dəhşəti və bu danışıqdan eşidə bildiyin "erməni" sözü... Uşaq ağlın ilə düşündüyün – "qonşumuz erməmimi?" və nəticəyə gəldiyin, – "Axı qonşumuz bizə pislik etməz" – cavabı.... May ayı, dağ havası, həyətdəki tut ağacı və bu ağaca asılmış qızılı zəncir asılqanlı yelləncək... Bir uşaq daha nə istəyə bilər ki?! – Yox bala, həyətə olmaz, evdə oyna!!! – Niyə, ana? – sualı... Və ana cavab verməyə macal tapmamış, insanı qəflət röyasından ayıldan o vahiməli səs... Həyətə atılan qrad mərmisi və tut ağacının tikələri arasında demək olar ki, görsənməyən o yelləncək! İlahi, bir uşaq üçün bundan dəhşətli nə ola bilərdi???!!! Şirin yuxudan ayılanda özünü isti yorğan-döşəyində deyil də, yaxınlarının əhatəsində daşlı-kəsəkli yollarla vətənindən "qaçan" görürsən, hamı can dərdindəykən sən – "Ana indi yelləncəyim nə olacaq?" – deyirsən. Sənin körpə qəlbindəki yelləncək düşüncəsi, valideynlərinin qəlbindəki "ya qızım o yelləncəkdə olsaydı, ya o da tikə-tikə olsaydı" fəryadı... Bəlkə də ətrafındakıların Allaha uşaqlarını sağ-salamat saxlaması üçün etdikləri dua sayəsində gedəcəyin yerə çatırsan... Qonaq olduğumuz yer nə qədər rahat olursa olsun, insan öz evində tapdığı rahatlığı heç yerdə tapmır. Uşaqlığını yad şəhərdə, sənə ayrı-ayrı baxışlarla baxan gözlərin arasında, – "Niyə qoyub gəldiniz torpağınızı" – deyə düşünən insanların belə olduğu yerdə keçirir və sənə "qaçqın" deyərək lağ edən uşaqlardan qaçırsan. Uşaq ürəyinə yara salmamaq üçün bütün gününü maraqlı etməyə çalışan valideynlərinə günün sonunda yenə də: "Evimizə nə zaman qayıdacağıq?" – sualını verirsən... İlahi, övladının sualına verəcək bir cavabı olmamaq valideyn üçün necə də ağır bir hissdir... Evin, sevimli yelləncəyin, oyuncaqların, hətta qonşu uşaqları üçün belə darıxırsan və bu itkilərin vurduğu yara qəlbini ağrıdarkən, bir də dünyanın ən güclüsü sandığın, yoxluğunu həyatın boyu hiss edəcəyin bir insanı – atanı itirirsən... Artıq illər keçir və sən böyüdükcə bütün bu itkilərin ağrısını daha çox duymağa başlayırsan. Və zamanla anlayırsan ki, sənin

evin artıq buradır deyəsən. Qəlbinin dərinliklərində nə vaxtsa vətənə qayıtmaq qığılcımı olur, nailiyyətlər əldə edirsən, böyüyürsən, ixtisas sahibi olursan, amma qəlbində hər zaman bir sual yaşayır: "Hara getdi uşaqlığım???!!! "Cavabını heç cür tapa bilmədiyin o sual... Çılğın olursan, böyük yaşda belə bəzən uşaq kimi davranırsan, uşaqlıqdan doymadığın üçün hər yaşında uşaqlığını gəzirsən... Göründüyü kimi, mənim uşaqlığım nə maraqlı, nə də qayğısız olub. Demək ki, "uşaqlıq illəri insan ömrünün ən qayğısız, ən maraqlı illəridir" deyimi heç də bütün uşaqlara şamil edilmirmiş... Uşaqlığımdan xatırladığım ancaq yuxarıda yazdıqlarımdır... Bu yazını yazarkən, nədənsə, Ramiz Rövşənin aşağıdakı misralarını xatırladım:

***Bir səhər yuxudan durub,***
***özünü uşaq görəsən,***
***Görəsən hamı evdədir,***
***ölənləri sağ görəsən...***

Mən inanıram ki, Laçın azad olunacaq və o zaman, qəlbində vətən həsrəti ilə bu dünyadan köçən atalarımızın, analarımızın ruhları şad olacaq, Laçını heç görməyən, müxtəlif regionlarda dünyaya göz açıb, Laçını yalnız və yalnız təsəvvüründə canlandıran gənclərimizin, uşaqlığını yad şəhərlərdə min bir çətinliklər içərisində keçirərək uşaq olmağa doymayan insanlarımızın, Laçında erməni tapdağı altında rahat yata bilməyən qəbirlərdəki ata-babalarımızın ruhlarındakı sevinc güclü bir leysan yağdıracaq və üçrəngli bayrağımız o yağışda Laçın səmasında laçın quşu kimi ucalaraq dalğalanacaq, bax o zaman bizə qaranlıq olan bu dünya bizlər üçün də işıqlanacaq!!!



**Şəbnəm CƏBRAYIL**

**POEZİYA**



**ƏNVƏR LAÇINLI**
**(Didərgin Ənvər)**

**“QƏRİBLİKDƏ KEÇƏN GÜNLƏR”**
kitabından...

### LAÇINDI

Mənim kimliyimi bilmək istəsən,
Yurd-yuvam Laçındı, elim Laçındı.
Namazım, orucum, dinim, imanım,
İçərim Laçındı, çölüm Laçındı.

Bu qara qaşlarım, bu qara gözüm,
Kitabım, dəftərim, dastanım, sözüm.
Qohumum, övladım, bir də mən özüm,
Dodağım Laçındı, dilim Laçındı.

Dağlarım, yaylağım, oylağım, bağım,
Çaylarım, göllərim, narzan bulağım.
Loğman beçə balım, yağım, qaymağım,
Çiçəyim Laçındı, gülüm Laçındı.

Qartallar oylağı uca dağ başı,
Qırxqız, Sarıbaba, Dəlidağ qaşı.
Uzunyal, Mıxtökən, o Çıraq daşı,
Çaylarım Laçındı, gölüm Laçındı.

Əriməz, Əyriqar loğman havalı,
Bütün Qarabağın qoyunu, malı.
Bərəkət çuvalı, unlu-urvalı,
Xırmanım Laçındı, vəlim Laçındı.

Almazım, uranım, misim, zərlərim,
Cincilim, gicitkən, əvəliklərim.
İgid ərənlərim, igid nərlərim,
Qollarım Laçındı, əlim Laçındı.

Sultan bəy, Ağamməd, Ağalar, Murad,
Fərxanlı, Haçadil, Göydəmir, Boz at.
Qaytaraq vətəni yaşasın bu ad,
Qamətim Laçındı, belim Laçındı.

Bağçalar mənimdi, bağlar mənimdi,
Milyonla vətənsiz ağlar mənimdi.
Didərgin Ənvərəm, dağlar mənimdi,
Cığırım Laçındı, yolum Laçındı.

### BELƏYMİŞ

Dərdimə minlərlə dərdlər qarışıb,
Ürəyim od tutub, yanıb, alışıb.
Saqqalım ağarıb, üzüm qırışıb,
Elə bilirlər ki, telim beləymiş.

Tökülüb dişlərim, dilim titrəyir,
Tutulub gözlərim, belim titrəyir.
Bükülübdü qəddim, əlim titrəyir,
Elə bilirlər ki, əlim beləymiş.

Geydiyim əbrişim, tirmə şal olub,
Yediyim yağ-qaymaq, bir də bal olub.
İndisə Laçınsız dilim lal olub,
Elə bilirlər ki, dilim beləymiş.

Yurd-yuvasız məni qəm-qüssə alıb,
Vətəndə vətənsiz gözlərim dolub.
Nərgizim saralıb, bənövşəm solub,
Elə bilirlər ki, gülüm beləymiş.

Mahnılar qoşardım hər şirin dilə,
Dərəyə, təpəyə, çəmənə, çölə.
Sonalar perikib heç gəlmir gölə,
Elə bilirlər ki, gölüm beləymiş.

Ellərim aldandı, qaldı çarasız,
Töküldü çöllərə unsuz-urvasız.
Kimi yurdsuz qaldı, kimi yuvasız,
Elə bilirlər ki, elim beləymiş.

Ənvərəm, mindiyim yorğa at olub,
Obamda həmişə toy-büsat olub.
İndi bel bükülüb ikiqat olub,
Elə bilirlər ki, belim beləymiş.

**KİTAB RƏFİ**

## “TALEYİ KÜR ŞAİR”




“Elm və təhsil” nəşriyyatında “Taleyi kür şair” adlı yeni kitab çapdan çıxıb. XX əsr Azərbaycan ədəbiyyatının görkəmli ədəbi simalarından olan xalq şairləri Bəxtiyar Vahabzadənin, Süleyman Rüstəmin, Xəlil Rza Ulutürkün, Osman Sarıvəllinin, xalq yazıçıları Mirzə İbrahimovun, Süleyman Rəhimovun və digər ustadların əqidə dostu və məsləkdaşı, istedadlı şair Zindani Səyyah Məhəmməd Didərginin ədəbi yaradıcılığının müəyyən bir hissəsinin toplandığı bu kitab müasir Azərbaycan oxucusuna gözəl bir töhfədir. Gənc tədqiqatçı-şair Məhəmməd Köçkünün toplayaraq araya-ərsəyə gətirdiyi kitabda Səyyah Məhəmmədin müxtəlif dövrlərdə qələmə aldığı gözəl bədii lövhələri, eyni zamanda sürgünlük illərində yazdığı mübarizlik ruhu aşılayan şeirləri, dostlarının ona ünvanladığı bəzi məktublardan nümunələr, haqqında mətbuatda işıq üzü görmüş yazılardan parçalar oxuculara təqdim olunur. Kitab məşəqqətli ömür və keşməkeşli yaradıcılıq yolu keçmiş küskün taleli oxucuları ilə hələlik ilk “görüşü”dür.

Kitabın redaktoru filologiya üzrə fəlsəfə doktoru Qiymət Məhərrəmli, ön sözün müəllifi Dərviş Osmandır (Borçalı).

Geniş oxucu kütləsi üçün nəzərdə tutulmuş kitabın maraqla qarşılanacağına əminik. Sağlığında üzü gülməyən taleyi kür şairin ruhu şaddır yəqin ki... Bu kitab həm də qəbri Belarus torpağında uyuyan şairin doğma Vətəndə ədəbi və əbədi abidəsidir.

**ARAŞDIRMA**

## ÖTƏRXAN ELTAC



*Məmmədov Ötərxan Əyyub oğlu 1970-ci il fevral ayının 15-də Laçın rayonunun Quşçu kəndində dünyaya gəlib. Orta təhsilini də doğulduğu kənddə alıb. Hələ 9-10-cu siniflərdə oxuyarkən "Laçın", "Şuşa", "Qarabağ" qəzetlərində ara-sıra şeir və məqalələri çap olunurdu.*

*O, 1994-cü ildə ABU-nun jurnalistika fakültəsinə əyani, 1995-ci ildə isə ADMİU-nin rejissorluq fakültəsinə qiyabi qəbul olunub. Hər iki ixtisas üzrə eyni vaxtda təhsil alıb. Tələbəlik illərində yazdığı şeirləri toplayaraq, 1995-ci ildə "Həsrətindəyəm" adlı ilk kitabı ilə oxucuların görüşünə gəlib. Tələbəlik illərindən "Sözə-söz" ədəbi birliyinin üzvü olub. Birliyin "Almanax" adlı toplusunda şeirləri yer alıb. "Təhsil", "İnam ocağı", "Alternativ", "Azərbaycan gəncləri" və s. qəzetlərdə mütəmadi şeir, hekayə və məqalələri dərc olunub. O, "Qızıl qələm" mükafatçısı olmaqla yanaşı, həm də Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür.*

*Ötərxan Eltac uzun müddət KİV-də çalışaraq, redaktor vəzifəsinə qədər yüksəlib, yaradıcılığı dövründə onlarla kitabın korrektoru və redaktoru olub. "Bir ovuc torpaqdır yarama məlhəm" (V.Əsgərovla birgə, 2012) və "General-polkovnik Tofiq Ağahüseynovun həyat yolu" (2013) kitablarını oxucuların ixtiyarına verib. 1997-ci ildən Azərbaycan Televiziya və Radio Verilişləri QSC-də çalışır (ssenari müəllifi).*

## QUŞÇU TARİXİNDƏN

Quşanlar təxminən 227-ci illərdə böyük bir dəstə ilə (2-ci dəfə) Şimali Qafqaza, Kiçik Qafqaza, Güney Azərbaycana səpələniblər. Azərbaycanda "Quşçu" adlı çox sayda kəndin varlığı quşan hunlarının burada yurdlaşdıqlarına güclü bir dəlildir (Rəşid İsmayılov). Müəllif tarixi məlumatlara əsaslanaraq yazır ki, miladın 227-ci ilində Azərbaycana quşan (qara hun) və sabir orqunları gəldilər. Hunların əskidən bəri Azərbaycanda məskunlaşan qan qardaşları ilə, yəni Ağvan ölkəsində türk qövmündən olan qəbilələr ilə birləşdilər (Ə.Hüseynzadə).

Quşçu toponimi türk tayfasının adını özündə ehtiva edir. Bəzi tədqiqatçılar Quşçu tayfasını qara hunların bir qolu, digərləri isə samrat tayfalarının quşilər qolu ilə əlaqələndirirlər.

Quşçu həm də totem anlayışlı toponimik addır. Türk mənşəli toponimlər sistemində quş və heyvan onqonları ilə bağlı adlar xüsusi yer tutur. Türkdilli xalqlar da başqa xalqlar kimi quş, heyvan və bitkilərə sitayiş ediblər. Bu gün də quşlardan qaranquşu, leyləyi, göyərçini, alabaxtanı, bülbülü, bayquşu vurmaq günah sayılır. İnanca görə, onları vuranlar Tanrı tərəfindən cəzalandırılır.

Türküstanın şərqindəki indiki Turfan şəhərinin yerləşdiyi vilayət də o zaman Quşi adlanırmış.

Quşçu toponimi qazaxlarda – quşi, başqırdlarda – quşçu, koşsı, türkmənlərdə – qotçi, noqaylarda – quşsi, qırğızlarda – quşçu və s. variantlarda Şimali Qafqazda, Orta Asiyada, İran və Türkiyədə də yayılıb. M.İsmayılovun fikrincə, bu toponim hun qəbilələrindən olan quşanların – qara hunların adı ilə bağlıdır. İlk dəfə N.A.Aristov quşçu tayfasının hunlarla əlaqədar olduğunu söyləyib. M.H.Vəliyevə görə, Quşçular eramızın III-IV əsrlərində Azərbaycana gəlmiş hunların qalıqlarıdır. Onun fikrincə, Azərbaycana 227-ci ildə gəlmiş hunlar quşan (qara hunlar) və hun – sabirlər idi. Abramson və Ə.Hüseynzadə bu etnonimin kökündə türk və Azərbaycan dillərindəki kuş (quş) sözünün durduğunu və bütünlükdə etnonimin “ovlayan quşla məşğul olan” mənasını verdiyini söyləmişlər. Lakin geniş areala malik Quşçu toponimləri və Quşçu tayfa adları aydın göstərir ki, onların ov quşu ilə heç bir əlaqəsi yoxdur.

Monqolların Şimali Qafqaza hücumu zamanı quşanlar 1222-ci ildə (yenidən) Azərbaycan, Gürcüstan, Dağıstan, İran, Qara dəniz və Xəzər dənizi sahili ovalıqlarına yayılıblar. Quşanlar döyüşkən, əyilməz, məğrur, cəsur və sözübütöv türk tayfalarından biri olublar. Bu qədim tayfa adı ilə tanınan 38-ə qədər yaşayış məntəqəsi mövcuddur.

Quşçular türkdilli etnik birlik olub, türkmən, qırğız, özbək, başqırd və Azərbaycan xalqlarının etnogenezində yaxından iştirak ediblər. XIII əsr tarixçisi F.Rəşidəddinin məlumatına görə, Təkudar (1282-1284) və Arqun xanın (1284-1291) dövrlərində nüfuzlu sərkərdələrin əksəriyyəti Quşçu tayfalarından idi. Elxani hökmdarı Olcaytu xanın (1304-1316) dövründə əsas hərbi qüvvələrin quşçu soyundan olması mənbələrdə öz əksini tapıb.

İbn əl-Əsəvinin və başqa müəlliflərin məlumatına görə, Mazik Quşçu, Şeyx Əli Quşçu və Məhəmməd Quşçunun başçılığı ilə 1222-ci ildə 50 min qıpçaq (bəzi mənbələrdə qıpçaqların elə quşçulu olduğu vurğulanır) Şimali Qafqazdan Dərbəndə keçərək, Azərbaycanda bir sıra böyük şəhərlərin hakimlərindən sığınacaq istəmişlər. Quşçuların Gəncə Əmiri Quşqaraya məktubla müraciətində deyilir: “Biz sizin sultana xidmət etməyə hazır olsaq da, Şirvanşah bizə mane oldu, ona görə də onun ölkəsinə soxularaq əzəldən

bizə məxsus olmuş qalanı ələ keçirdik. İndi isə girovlarımızı sizə göndəririk. Biz gürcülərlə dilbir olsaydıq, Dərbənd keçidindən keçməzdik, çünki bu yol ən çətin və yorucu yoldur. Biz onların vilayətinə əvvəllər keçdiyimiz kimi keçərdik."

Fikirləri götür-qoy etdikdən sonra Əmir Quşqara Atabəy Özbəklə məsləhətləşmiş və qıpçaqlara (quşanlara) Gülgün dağının ətəyində məskunlaşmağa icazə vermişdir.



Müşahidələr göstərir ki, qədim Azərbaycan torpaqlarında qıpçaq (quşan) tayfalarının məskunlaşması heç də XIII əsrə təsadüf etmir. Bu oturaqlaşma daha qədim dövrlərdən başlamışdır. Ə.Hüseynzadənin o fikri ilə razılaşmaq olar ki, 1223-cü ildə Arrana gələn qıpçaqların bir qismi Gürcüstana – həmtayfalarının yanına yollandılar. Heç şübhəsiz həmin dövrdə (XIII əsr) Azərbaycanın bir çox yerlərində Quşçu tayfası məskunlaşmışdı. Bugünkü Quşçu kəndləri də həmin dövrün yadigarıdır. Daşkəsəndə, Şamaxıda və Laçında – Quşçu; Kürdəmir və Qəbələ rayonunda – Quşlar; Qazaxda – Quşçu-Ayrım; Daşkəsəndə - Quşçu Körpüsü qəsəbəsi; Tovuzda – Aşağı Quçşu, Yuxarı Quşçu, Dondar Quşçu; Göygöldə – Quşçu-Goran; Goranboy, Şuşa, Cəbrayılda – Quşçular; Xocalıda isə Quşçubaba kəndi quşçu türk tayfasının adını özündə yaşadır.

Hələ hunların tərkibində olduqları zaman böyük hörmətə sahib olan quşanlar güc strukturlarında geniş sahəni əhatə etmişlər. Qorxmaz və döyüşkən quşan əsgərləri orduda ən qabaqcıl vəzifələri icra edirdilər. Ölkə başçısının ən etibar etdiyi və inandığı kəslər də məhz quşanlar idi. Ordu daxilində hansısa problemlər yaşananda, kiməsə qarşı ədalətsizlik ediləndə onun çözülməsi quşanlara həvalə edilirdi. "Quşçu şahidi" anlamı da elə bu səbəbdən yaranıb. Böyük bir fəlakətdən qurtulmaq üçün ədalət naminə yalnız bir quşçulunun şahid durması, şahidlik etməsi yetərli idi. İndi də el arasında, çətinə düşmüş

bir məsələni həll edərkən tez-tez deyilir, deyəsən, "Quşçu şahidi" lazım olacaq. Nədənsə, bu ifadədən sonra məsələ öz həllini tapırmış. Bu hal da quşçuluların sözübütöv, mərd, cəsarətli və qorxmaz olmalarına əyani sübutdur.

N.Piqulevskaya yazır ki, kuşanların içərisində digər türk tayfaları da vardı. Kuşan çarlarının yabqu adlanması bunu aydın göstərir ki, bu da "şahzadə" deməkdir. Təbəri XIX əsr Kuşan çarlarını "Xoqan" adlandırmışdı. Beləliklə, həm tarixdə, həm də dilçilikdə "ağ quşu saxlayan" Şahzadə Xoqan mənalarını daşıyan bu tayfanın oğuz yurdunda özünəməxsus yeri olub (B.Budaqov, Q.Qeybullayev). Ə.Hüseynzadə isə quşçu tayfasının Azərbaycana gəlişini monqolların Şimali Qafqazı alması ilə əlaqələndirmişdir. Lakin Ə.Hüseynzadənin fikri inandırıcı deyildir, çünki XII əsrə aid erməni mənbələrində Azərbaycan ərazisində şirvan, bakan və başqa tayfalarla yanaşı quşi tayfasının adı da çəkilir. Maraqlı odur ki, Zaqafqaziya toponimiyasında bu etnonim həm Quşi, həm də Quşçu formalarında öz əksini tapmışdır.

Azərbaycanda quşi etnonim əsaslı etnotoponimlərin yayılma areallarına aşağıdakı bölgələr daxil edilir: Quba, Şamaxı, Ağdam, Qazax, Cəbrayıl, Şuşa, Qax, Daşkəsən.

Azərbaycan ərazisində yaşamış quşçu tayfasının adı Şamaxı rayonundakı Quşçu dağının (hündürlüyü 1421 metr) adında qalmışdır. Respublikamızda Quşçu dağı Daşkəsən rayonu ərazisində; Quşçu ayrığı, Quşçu qalası dağı (Laçın rayonu, Quşçu kəndi), Quşçular dağı (Xocavənd rayonu), Quşçunun yalı (Gədəbəy rayonu, Göyəli kəndi) oronimləri və s. qeydə alınmışdır.

Oğuz rayonunun Yaqublu kəndinin cənubunda Quşlar adlı kənd xarabalığı da vardır. Keçmişdə Kuban əyalətində Quşi xutoru və Quşi adlı bir neçə kənd olmuşdur. Bütün bu faktlar quşinin etnonim olmasını sübuta yetirməklə yanaşı, onun geniş arealda yayılmasını göstərir (M.İsmayılov).

*Ürəyim qəm dolu Quşçu həsrəti,*
*Quşçu həsrətindən ağarıb saçım.*
*Bilsəydim gəlməzdim dərdli Quşçuya,*
*Gəldimsə, Quşçudan hayana qaçım.*

*Quşçu! – ana yurdum, inləmə daha,*
*Fındıqlı çal-çarpaz dağı sinəmdə.*
*Qəlbimin nisgilin qoparammıram,*
*Xəyalım dolaşır "Moruq çəmən"də.*

*Mən necə qıymışam Korcabulağa,*
*De, indi çağlayır, axırmı görən?!*
*Uçuq pəncərədən boş otaqlara,*
*Körpə qaranquşlar baxırmı görən?!*

*Ruh olub hopmuşam gülə, çiçəyə,*
*Hər gülün qoxusu, təravətiyəm.*
*Hansı ürəklərdə vətən sevgisi*
*Varsa, o ürəyin məhəbbətiyəm.*

*O Qoşa Qalacıq qoç igidlərin,*
*Qeyrətin, namusun bir simvoludu.*
*Hardasa Quşçuya uzanan bir yol,*
*Məkkənin yoludu, Haqqın yoludu.*

*Mis yeri, Dik güney, Ağ yol, Tək ağac,*
*Düşmənə yurd olub, qəlbimə ləkə.*
*Quşçunu silahla qaytarmalıyıq,*
*Qayıtmaz gözlərdən yaş tökə-tökə.*

*Bax, o da lazımdı: şadlıq evləri,*
*Hərdən də mağarda çalaq, oynayaq.*
*Bütün Qarabağı qaytaraq geri,*
*"Keçəl" başımıza bir papaq qoyaq.*

Nəinki Şimali və Cənubi Azərbaycan ərazilərində, ümumiyyətlə, Şərq regionunda türklərin çox-çox qədim zamanlardan yaşaması dünya tarixçiləri tərəfindən təsdiqini tapıb. 2500 il bundan əvvəl bu ərazilərdə məhz türklərin yaşamasını tarixin atası sayılan Herodot da qeydə alıb.

Tanınmış tarixçi alim Z.Yampolski "Azərbaycandakı türklər barəsində qədim mənbələr" adlı əsərində yazır: "Mixi yazıların, habelə ilk mənbələrin məzmunu bunu deməyə əsas verir ki, türk dili Azərbaycanda eramızdan əvvəlki dövrlərdə peyda olub". VII əsr ərəb tarixçisi Curhumi bildirir ki, Azərbaycan lap qədim çağlardan türklərin vətəni sayılır. Türklər bu ərazidə çoxdan məskunlaşmışlar.

Tarixi mənbələrdə belə bir məlumat var: Xəlifə Müaviyyə bir dəfə qədim tarixin mahir bilicisi olan yəmənli Abid ibn Şoriyədən soruşur: "Türklər və Azərbaycan nə deməkdir?" Abid cavab verir: "Azərbaycan qədimdən burada yaşamış türklərin ölkəsidi."

1126-cı il fars tarixinə aid daha bir mənbədə də Azərbaycanın lap qədimdən bir türk ölkəsi olduğu bildirilir.

603-cü ildə İran ordusunun əsas qüvvələri Ermənistan və Mesopotamiyanın sərhədlərində cəmləşəndə Şərqdə üsyan qalxdı. Quşan (Quşçu) qoşunları yürüş üçün bütün yer üzünə yayıldı.

Bizans şahı Xosrov Pərviz yürüşün qarşısını almaq üçün tələsik özünün ən yaxşı mərzbanı Sumbat Baqratunini yanına çağırdı və quşanları əzdi. Qələbədən məmnun qalan Sumbat Apşəhərdə (Nişapur yaxınlığında Xorasan vilayətində şəhər) düşərgə salır və 300 nəfərlik dəstə ilə Xroxt şəhərində pusquda durur. Təkbaşına farsların öhdəsindən gələ bilməyəcəklərini görən quşanlar qan qardaşları olan qonşu qəbilələrə (türklərə) müraciət edirlər. Tanınmış sərkərdə Cembuxi (Tap Cabqu) öz qoşunu ilə onların köməyinə gəlir. Gözlənilməz zərbə farsları çox sarsıdır. Sumbat 3 nəfər tərəfdaşı ilə mühasirədən zorla canını qurtarır. Beləliklə, quşçular qonşuları ilə birlikdə Rey və İsfahanı darmadağın edirlər.

Bir müddətdən sonra Sumbat yeni qoşunlarla quşanlar üzərinə hücuma keçdi. O, Bəlxə qədər gedib çıxsa da, Toxaristanda möhkəmlənə bilmədi və yenidən Sasanilər dövlətinin şərq sərhədi Murqaba qayıtdı. Bundan sonra quşanları susdurmaq daha da çətin oldu.

**Bulaqlar.** Ta qədimdən kənddə iki əsas bulaq olub: "Böyük bulaq" və "Korcabulaq". Üçüncü bulaq isə "Qəhrəman bulağı" adlanır ki, Süleyman oğlu Qəhrəmanın adı ilə bağlıdır, "Böyük bulaq"dan 50 metr şimal tərəfdə dərənin içində olub. Bulaq sısqa olduğu üçün istifadə olunmayıb. Sonralar ətrafda yaşayan insanlar həmin dərəni zibilxanaya döndərmiş, bunun nəticəsində bulaq sıradan çıxmışdır. Təxminən, 1985-ci ildə İsa Bəylər oğlu "Qəhrəman bulağı"nı qazıb çıxarmış, Şaşılar məhəlləsi tərəfdə dərənin içində yenidən bərpa etmişdi. Bütün xərci öz üzərinə götürən İsanın xeyirxahlığı nəticəsində hər biri 3 metr uzunluğunda ikinovlu bulaq kənd təsərrüfatının inkişafında böyük əhəmiyyət daşıdı. Bulaq hazırda "İsa bulağı" adlanır.

Albanizm dövrünün qalıqları onu sübut edir ki, kəndin aşağısında (şərqində) yerləşən "Uşaq qalası"nı su ilə təmin etmək üçün "Korcabulaq"dan tüylərlə (borularla) qalaya su çəkilib. Uçulub dağılmış qala divarlarının yanında hətta su anbarı da olub. "Uşaq qalası" "Qalacıq" dediyimiz ərazidə tikilib, hər ikisi də strateji əhəmiyyətə malikdir. Buranın gözətçi (müşahidə) məntəqəsi kimi istifadə edilməsi daha inandırıcı və ağlabatandır. Elə isə, niyə "Uşaq qalası" adlanır?

1468-ci ildə Qaraqoyunlu dövlətinin süqutundan sonra Ağqoyunluların Osmanlı imperiyası ilə savaşları nəticəsində bir çox tayfaların yerdəyişməsi halları tez-tez baş verdiyindən və ərazi iddiaları hər iki dövlət tərəfindən əsas şərt olduğu üçün tutduqları ərazilərdə hər kəsə divan tutulurdu. Bu baxımdan dağətəyi və dağlıq yerlər döyüş üçün əlverişli sayılırdı. Çünki az itki verməklə qələbə şansını əldə etmək xeyli asanlaşırdı.

Mənbələrə əsasən, osmanlıların gözlənilməz həmləsi nəticəsində kənd əhalisi – əksəriyyəti uşaq olmaqla, qadınları da həmin qalaya yığaraq döyüşə yollanır. Osmanlılar uzaqvuran toplarla qalanı darmadağın etsələr də, kəndin müdafiəsini yara bilmirlər. Qalada olan qadınların və uşaqların əksəriyyəti osmanlıların qurbanı olur. Bu faktın özü qalanın "Uşaq qalası" adlandırılmasına sübut deyilmi?

**Korcabulaq.** Mənbəyi 10-12 m$^2$ ərazini tutsa da, sonradan qazmalar nəticəsində ərazi genişləndirilib və bulaq halında, daha doğrusu abidə-bulaq (ilk dəfə) 1934-cü ildə Kərim Kərbəlayı Nəzər oğlunun şəxsi vəsaiti hesabına istifadəyə verilib (bəzi mənbələrə görə bulaq 1890-cı ildə inşa edilmişdir). ***Tağvaridir, üzü şərqə baxır, 2 x 1 x 0.80 həcmində 4 novdan ibarətdir (ikisi içəridə, ikisi bayırda). Hər iki tərəfində kiçik dərə, qarşısında isə şose yolu var. Qaraçöp ərazisində kiçik dərələrin qovuşuğunda yerləşir.***



**Böyük bulaq.** Mənbələrə əsasən, 7-ci əsrin əvvəllərində kənddə fəaliyyət göstərən yeganə "bulaq – abidə" olub. Müharibələr nəticəsində dağılsa da, ərəblərin işğalı zamanı bulaq yenidən bərpa edilib. Ancaq əsrlər keçdikcə bulaq – abidə eroziyaya uğramış, böyük bir hissəsi uçulub dağılmışdı. Baxmayaraq ki, kənd əhalisinin təminatını məhz bu bulaq ödəyirdi. Ona görə də alban dövrünün yadigarı olan abidənin təmirə ehtiyacı vardı.



***Bulaq tağvaridir, üzü şərqə baxır, hündürlüyü 3 m-dir, 2.20 x1.10 x 0.70 həcmli 3 novdan ibarətdir. Girişə qədər olan hissədə 30 metr uzunluğunda olan səki düzəldilib, alt tərəfini isə boyu 20 metrə çatan söyüd və çinarlar bəzəyir.***

XX əsrin 1-ci yarısında el ağbirçəyi Sədəf nənə (Xanlar Yusifovun anası) şəxsi vəsaiti hesabına bulağı təmir etdirib əhalinin ixtiyarına verir.

Qəribədir ki, bəzi mənbələrdə bulağın XV əsrə aid olduğu qeyd edilir. Ancaq Albaniyanın ərəblər tərəfindən işğalı nəticəsində ərazilərin coğrafi baxımdan xeyli dəyişdirilməsindən ta Ağqoyunlu dövlətinin süqutuna qədər olan məsafədə Quşçu kəndi yaşayış məskəni olub (kənddə aşkar olunan 2 və 3 mərtəbəli qəbirlər, mağaralar (kahalar) və kurqanlar buna əyani sübutdur). Yaşayış olan yerdə isə həmişə suya böyük tələbat olub.

Bulağın tağı üzərində ərəbcə yazılmış tarix faktın hansı əsrə aid olduğuna işarədir. Baxmayaraq ki, ərəblər də bu bulağı yalnız bərpa etmişlər. Sonuncu bərpa zamanı dağıntılar arasında xaçşəkilli daşlara da təsadüf edilib (o da məlumdur ki, hələ islamdan əvvəl türklər xaça sitayiş etmiş, onu günəşin, odun, alovun rəmzi kimi qiymətləndiriblər). Təəssüf ki, bulağın bərpası zamanı ərəblər işğalçılıq siyasətini davam etdirərək, bulağın daş yaddaşını da saxtalaşdırmışlar.

Kənd əhalisinin böyük əksəriyyəti dindarlardan ibarət olduğu üçün bərpa zamanı ərəb qrafikasına (yəni, növbəti bərpa zamanı əlavə olunan daşlara) üstünlük vermiş, ilk variant (alban dövrünün nişanəsi) – günəşin rəmzi olan daşlar isə lazımsız əşya kimi tullanmışdır. (Atılmış daşlar 1988-ci ilə qədər bulağın alt tərəfində – dərədə qalırdı).

"Böyük bulaq" və "Korcabulaq" – hər iki abidə quruluşca bir-birinin eynidir.

**NƏSR**



**Oqtay QORÇU**

## GEDİRƏM... MƏNİ AXTARARSINIZ...
*(hekayə)*

Onu otağa salıb dedilər ki, bir az gözləsin, çünki yanına gələn var və hazırda sənədləşmə aparırlar, indilərdə buraxacaqlar içəri. Eşitdiyi xəbərə sevindi, həm də qəribə bir nigarançılıq sardı onu, elə bil ürəyinə damdı, könülsüz düşündü: "Deyəsən bu gün də xoş xəbər olmayacaq". Yəqin yenə şikayət eşidəcək, yenə də yanında gözünün yaşını sel kimi axıdıb onu da kövrəldəcəkdi kimsə. "Lənət şeytana! Səbir edək görək..." pıçıldayıb iri mavi gözlərini zillədi zindan təki ağır qara qapıya. Özünə təsəlli verə-verə bir əlçim ümiddən dağ qurdu anın qovağında, özünə ürək-dirək verdi: "Heç nə də olmayacaq, boş şeydi" və darıxmamaqdan ötrü barmaqlarının quluncunu sındıra-sındıra gözləməyə davam etdi. Ayağa qalxdı, əl-qolunu açdı, bəzi idman hərəkətləri elədi, bir az otağın içində o baş-bu başa gəzindi, qayıdıb təzədən oturdu, masada nağara ritmi tuta-tuta taqqıltı saldı, nəhayət, dəhlizdə ayaq səsləri eşidildi və gələn adamın hənirini duyunca nağara musiqisini kəsdi. İnsafən bu dəfə çox gözlətmədilər onu. Əslində bekarçılıq onu bezdirsə də heç darıxmağa macal da tapmadı, yavaş-yavaş vərdiş edirdi qazamat həyatına. 52 gündən çox idi ki, məhkəməsiz-filansız həbsdə saxlanan adam gözünü azadlığa dikib dururdu.

Şaqqıltıyla qapı açıldı, içəri girən adam çiyninin üstündən geriyə boylanıb arxasında dayanana "Ört!" əmrini verdi, guya bu kəlməni amiranə tərzdə söyləməsəydi dəmir qapını açıq qoyacaqdı uzun, sarışın gözətçi. Qapı örtüldü və içəri girən şəxsi görən kimi tanıdı, həmin adamdı yenə, onu istintaq zamanı dindirən kişi. Salam verdi, köhnə dost təki görüşdü onunla bu dəfə tək gələn adam, canıyananlıqla hal-əhval tutdu, bir yerinin ağrıyıb-ağrımadığını soruşdu, sonra onunla üz-üzə əyləşib dərindən nəfəs aldı, hələ zarafatyana göz də vurdu məhbusa. Bambaşqa birisi idi sanki qarşısında, heç belə görməmişdi onu, yaman üzügülər və kefi kök, həm də şıq görükürdü bu gün. Parıldayırdı elə bil zalım oğlu, göyə çalan kostyumu da lap əyninə biçilmişdi, çox yaraşırdı ona.

"Giriş pis başlamadı, görək bu gün nə istəyəcək məndən, nə olmalıdır axı? Yenə dilə tutacaq ki, sənə kömək eləmək istəyirəm, gərək yardımçı olasan, bildiyin nə varsa hamısını danışasan. Biz hər şeyi bilsək, sən də azad

olarsan. Nə deyəcək ki? Belə-belə qəşəng sözlər, sonra da valı dəyişəcək... Başlayacaq ki, ay nə bilim ağıllı ol, sən insanları tanımırsan, vaxtı itirmə... Qələt eləyirlər, elə hamısı! Mən yalançı deyiləm, mən satmıram, qoruyuram, gizlədirəm, yaşayıram ki, dostlar da yaşasın. Qoy bildiklərini eləsinlər... Aman, nə murdar havası varmış bu yerin!"

Onun göy gözlərinin içinə baxa-baxa sinəsini arıtlayıb lombasıyla qırağa elə tüpürdü ki, qarşısındakı "Vay!" deyə bağırdı, sonra iyrənə-iyrənə qan qusurmuş təki bir neçə dəfə xırıldadı, yerə tüpürüb diksinə-diksinə xeyli məhbusun qarasınca söyləndi, hələ dilindən ana söyüşü də çıxdı. Dindirmək üçün indi burada oturan adamın necə bir vəziyyətə düşdüyünü görmək böyük bir zövq, gözəl tamaşa idi onun üçün. Bir anın içində parıldayan bu adam büzüşüb dönmüşdü qara zibil paketinə. Qəzəbdən fınxırıb siqaret yandırdı və tüstünü dustağın üzünə üfürüb hədələdi: "Baxarıq... Görək haraya qədər gedəcəksən belə, səni elə sındırım ki..."

Gözlərini döyə-döyə baxdı qəzəbli adama. Boğanağa düşdü sanki birdən-birə, bezmişdi artıq eyni suallardan, dodağının altında mızıldandı:

- Yenə başlayacaqsan da...

Yüngülcə köksünü ötürdü, onu dindirəcək adama gözünü dikdi, bir daha özünə səbir, dözüm arzulayıb sakitcə gözlədi. Və özünü, içini-çölünü dönə-dönə çırpıb silkindi, şeytana lənət oxudu. Hələ gözü-könlü də açıldı bir az. Sevincək əhvalla xəbərdarlıq etdi:

- Qardaşım, mən hazıram ha!

- Sakit otur ! Burada hər şeyi mən həll eləyirəm, eşitdin?

Kinsiz, nifrətsiz, qəzəbsiz, hətta bir az da sevirdi bu binada oturub ona və başqalarına əzab verən bu adamları. Onsuz da o, kimsəyə sığınmayacaq, əfv diləməyəcək, qanunsuz saxlandığına, həbs edildiyinə görə heç şikayət ərizəsi də yazmayacaqdı, çünki elə bir zaman gələcəkdi ki, bu adamların hamısı ayağına düşəcəkdilər onun, dizin-dizin sürünüb "Bizi də gizlət, bizə də sığınacaq, ev tap" deyə yalvaracaqdılar. O bu şəxsləri onlardan da yaxşı tanıyırdı və elə tanıdığına görə də indiki şəraitdə şikayətli olmağın nə qədər gülünc göründüyünü anlayırdı. Həbs eləməyi, işgəncə verməyi özünə peşə seçənlərin qarşısında gərək sınmayaydı da, onlara yazığı gəlsə də onsuz da onların dediyini eləməyəcəkdi, intəhası əl çəkmirdilər, zəli kimi yapışıb qopmaq bilmirdilər yerdə özünü ixtiyar sahibi bilənin bazburutlu əlaltıları. Ağır-ağır qalxdı, dikəlib onu dindirəcək adama altdan-yuxarı qıyqacı bir nəzər saldı, səbirli ədayla qarşısındakını indi görürmüş kimi hələ "Xoş gəldin" də söylədi. Söhbət başlayanadək özünü tarazlamağa çalışdı, dindirməni keçirən şəxsin zəhmli görkəmi qarşısında dimdik durdu.

Şübhəli şəxs kimi tutulanı belə toxtaq görən qara eynəkli, qoltuğu qovluqlu müstəntiq başının işarəsiylə ona stulu göstərib dilləndi: “Gəzmə, otur, rahat danışaq”. Oturmağıyla da müstəntiqin ağzı açıldı, yenə dili durmadı: “Balam, yaman kefi kök görsənirsən bu gün, nədir, yoxsa yaxşı xəbər almısan? De, biz də bilək də, birdən dostun plan-zad cızar, çaşıb buralara gələr, səni qaçırdar, xəbərimiz olmaz ha! Muğayat ol, belə bir plan olsa əvvəlcədən de, biz də işimizi bilək. Ayıbdı axı, gərək qapıda maşın qoyaq sizin üçün, yoxsa qaçıb getməyin bir yana, piyada qalarsan yolda, biabır olarıq. Xəbər elə əvvəldən, yoxsa inciyərəm ha səndən, eşitdin?!”. Öz şit zarafatına özü də elə ürəkdən güldü ki, onun da dodaqları qaçdı, ancaq dillənmədi. Araya düşən qısa sükut da meh təki əsib keçdi. Nəhayət, söhbətə başlamağa qərarlı müstəntiq siqaret yandırıb hələ ona da birini uzatdı. Başını buladı. Sorğu-sual başlandı.

- İndi necəsən?

- Mənim heç vaxt pis günüm olmur, lap əlayam!

- Yaxşı! Yaxşı!

Və keçdi mətləbə:

- Belə... Hə... Dünyadır da, hər şey olur, bax, heç kim də bilmir ki, sabah başına nə gələcək. Neyləmək olar e, həyatdı da. Özün bilirsən ki, biz istəsək də, istəməsək də belə qurulub hər şey. Biz buyruq quluyuq, nələrisə dəyişmək bizim işimiz deyil. Biz bilmirik, işimizi görürük, vəssalam! Dünyanın qəribə işdəkləri var, hər sirr bir gün aşkara çıxır. Yəni dediyim odur ki, bir-birimizi incitməyək gərək. Əslində, bu həm də ümumi işimizin xeyrinə olar, yəqin sənin fikirləşməyə xeyli vaxtın da olub. Bilirsən, bax, açıq danışıram səninlə, sən də bilirsən e, intəhası yenə deyirəm, bax, bizim güdükçülər hər addımını izləyiblər sənin. Onsuz da heç nəyi gizlədə bilməyəcəksən, yeganə əlac bildiklərini danışmaqdı. Biz sənin də, onun da kim olduğunu lap yaxşı bilirik. Hə... Belə... Başlayaq da, nə deyirsən? Bildiyini danış, səni eşidirəm...

- Yaxşı, əgər belə operativ işləyirsinizsə, əgər hər şey sizə məlumdursa, onda məndən nəyi eşitmək istəyirsiniz?

- Sən də çox şey bilirsən, hamısını da danışacaqsan. Elə bu gün. Eşitdin?

- Onu tanımıram, görməmişəm.

- Yalan deyirsən!

- Onun adını sizin kimi mən də camaatdan eşitmişəm. Nə istəyirsiniz e, məndən?

- Bizi dolayırsan? Bu günəcən sağ qaldığına görə mənə borclusan, ay yazıq! Bilirsənmi, mən olmasam burada başına nə oyunlar gələr sənin?

Bilirsən, əlbəttə, lap gözəl bilirsən, amma... Adam gərək haqqı itirməsin, ay namərd! Sənə danış deyirəm, danış da, yoxsa sənə yalvarmalıyam, hə?! Hamısını danış! Elə bu gün danışacaqsan hər şeyi...

- Onu şəxsən tanımıram, belə qiyabi bilirəm ki...

- Yalan deyirsən!!!

- ...Sonra da kitablarını tapıb oxudum...

- Yenə yalan deyirsən!

- Mən yalan danışmıram! İnanmırsan heç inanma, özün bilərsən...

Əməlli-başlı ovqatı təlx oldu müstəntiqin. Kefinə soğan doğrayan məhbusa elə qəzəbləndi ki, hirsindən köynəyinin yaxasını açmaq üçün dartışdıra-dartışdıra bir-iki düyməsini də qırıb tökdü yerə. Boğula-boğula qıcındı:

- Qulaq as, deyəsən başın bədəninə ağırlıq eləyir ha! Danış, bildiyinin hamısını danış!

- Hədələməyin! Vallah, günahdır, belə zülm olmaz axı. Zorla boynuma qoyursunuz ki, yalan ifadə verim. Ağır günaha girirsiniz. Böyük günahdır! Günah!

- Ağzına-ağlına gələni danışma, istəyirsən anan-bacın görüşünə bura gəlib...

- Bir dəqiqə. Bir dəqiqə, bu hədədir, bu əxlaqsızlıqdır mənə qarşı. Mən vəkil tələb edirəm!

- Burada hakim də, vəkil də mənəm!

- Bəs qanun nə üçündür?! Hanı o ali qanunlarınız, harada qaldı?

Bu yerdə müstəntiq susdu və birdən səsini yumşaldıb sorğu-suala davam elədi:

- Sən cavan oğlansan, gözəl gələcəyin var, insafən heç pis adama da oxşamırsan, ancaq məni də başa düş, əlimizdə fakt var. Fakt nə deməkdir, yəqin başa düşürsən də. Onsuz da danışacaqsan, özgə çarən yoxdur onsuz da. Hər şey, hər şey aydınlaşanacan buradan çıxmayacaqsan. Bizi də düzgün anla, sizi bura gətirməkdə məqsəd əslində sizi cani bilib barənizdə hansısa ittiham irəli sürmək deyil, məqsədimiz üçün sadəcə bu da lazımdır, yəni hamı necə danışır sən də elə. Sadəcə bildiyini danışacaqsan, vəssalam! Sonra da buradan çıxıb düz gedəcəksən evinə-eşiyinə. Onsuz da biz onun kim olduğunu bilirik, bu dövlət qurulandan o, axtarışdadır. İndi isə əla fürsət yaranıb. Danış, əzizim, tərslik eləmə, danış, oğul, danışsana, axı sən onu uşaqlıqdan tanıyırsan. Uzun illər yoldaşlıq eləmisiniz, bir yerdə, eyni məhəllədə böyümüsünüz, nə işləriniz olub... Harada işləmisinizsə biriniz o birini çəkib yanına. Görürsənmi, əzizim, biz də bir şey bilirik ha. Danış, bu qədər inad etmək nəyə lazımdır axı? Danış! Yersiz hərəkətdir, bu yaşında özünü qəhrəman kimi hiss edirsən yoxsa? Allah bilir neçənci ildə gəlib sığınmısan ona,

neçə vaxtdır ki, onun evində qalırmışsan, eləmi?! Səni işdən qovublarmış özü də, illərlə onun evində yaşayıb onun çörəyini yemisən, onun qazancını xərcləmisən, əyninə pal-paltarı, ayaqqabını, hətta bahalı siqareti də onun puluyla almısan, yalan deyirəm?! Əlbəttə ki, yox! Görürsən ki, biz də boş yerə papağı günə yandırmırıq ha. Danış! Ay yazıq, ayrı əlac yoxdur e, danışmalısan onsuz da. Çox şey bilirik haqqında. Ancaq hər şeyi özün danışsan yaxşı olar, başla görək...

- Mənə ad günümdə bahalı İsveç saatı alıb bağışlayıb, bu fakt kifayətdir?!

- Məzələnirsən?!

Qəfildən qolaylanıb sol əliylə dustağın ağzının üstünə şillə vurdu:

- Danışacaqsan! Hər şeyi da-nı-şa-caq-saan!!!

- Uff! Əl çəkin də məndən. Bilmirəm, heç nə bilmirəm. Heç nədən, heç kimdən xəbərim yoxdur! Onusa heç tanımıram da...

- Dostuna yaxşılıq eləmək istəyirsənsə hər şeyi danışmağa məcbursan, başa düş ki, bu onun da xeyrinə olar. O özündən mif uydurub, ondan qəhrəman olmayacaq. O pul paylaya-paylaya bu şəhəri dəli eləmək istəyir, nə var e, qara camaatın başını aldadır da, yoxsa elə bilir bu yerlərin sahibi yoxdur?! O xalqa sahib çıxa bilməz, çünki bu ölkənin hökmdarı var. Bizim tək rəhbərimiz! Allah onu göy təki dirəksiz eləsin, ancaq o hər şeyi bizə verib ala bilər. Sən gəl bizim vaxtımızı hədər yerə alma, ağıllı adamsan, danış görək nə bilirsən, nə eşidib görmüsən?

- O, idealistdir, mən də onun vurğunuyam, bir də ki, o nə kimsəni dəli eləyib, nə də peşman. Mən ona özüm qədər inanıb canımdan da artıq sevirəm, bunu eşitmək istəyirdin?! O ancaq ehtiyacı olanların yanında olub həmişə. O, yardım etməkdən zövq alır. Ondan öyrənmək gərəkdir.

- Deməli, danışmaq istəmirsən?

Ayağa qalxıb qapını döydü, kəlpeysəri içəri çağırıb əlini uzatdı məhbusa:

- Ölüncə döyün! Sındırın bu...

Sözünü bitirməyə imkan vermədi, təlaşla bağırdı:

- Yaxşı! Yaxşı! Bu zülm də yerdə qalmaz, yaxşı, danışaram hər şeyi, sən isə mənə yaxın da durma, öküz! Barmağını da toxundurma!

- Danışırsan?

- Əgər onun yerini sizə söyləsəm, bəs mənim taleyim necə olacaq?

- Elə bu gün çıxacaqsan azadlığa, sənə söz verirəm!

- Sonra yenə tutub gətirəcəksiniz, eləmi?

- Sözümüz sözdür! Nə danışırsan, ay kişi, mən sənə söz verirəm e, kişi kimi! Kişi sözü!

- Axı mənim günahım olmaya-olmaya mən niyə burada olmalıyam ki?

- Vardı günahın, özü də çox. Sənin də günahın var. İntəhası olan oldu, keçən keçdi daha. Hə, haradadır o?

- Günahım ona dost olmaq...

- Tez ol da, yerini de, vaxt keçir...

- Mən necə satım onu sizlərə, axı günaha batıram ey, lənət şeytana!

- Çərənləmə, yerini söylə!

- Kifayətdir, lap ağını çıxartdınız! Sizə dözdüm ki, bəlkə... Düzələn deyilsiniz heç biriniz, onsuz da adam olmayacaq sizdən, daha mənim səbrim də aşıb-daşdı. O hər yerdədir, ünvanı da ki... Dünya böyük, səma, dənizlər, dağlar, sirli, gizlin qalan hər şey və...

Göz qırpımında dəyişdi hər şey. Səbirli məhbus, təhər-tövrünü dəyişmədən əllərini qoşalayıb uzatdı qazamatın tavanına və günəş təki parıldayan əllərin uzanmağı ilə də otağa gün doğdu sanki. Ağappaq işıq otaqdakıları öncə xumarlandırdı, müstəntiq bir anlıq huşa getdi elə bil, sonra vahiməyə düşdü, qorxudan dizləri büküldü. Ətraf bəyaza qərq olmuşdu. Beton divarlar, köhnə elektrik lampası, mis qab-qacaq, stol, stul və divardan asılan, üstündə ağ at rəsmi olan köhnə təqvim də əridi bu bəmbəyaz nur topasının içində. Hətta bahalı ingilis alışqanı da, ağzı yeni açılan, içindən iki siqaret əskik olan “Marlboro” qutusu da şüaların işığına sancılıb nura sovruldu. İşığın mərkəzində, kameranın düz ortasında, burum-burum burulan işıq selinin sinəsində canlı cazibə qüvvəsi təki duran və getdikcə hər şeyi nəzarətinə alan, eləcə də gözlər baxa-baxa ayaqları-əlləri uzanan, az qala binaya belə boy verən min bir adla tanınan adsız adam qorxusundan titrəyə-titrəyə ayağının altında yıxılıb qalan müstəntiqə, keşikçilərə baxmadan əks-səda verən zabitəli səsiylə dilləndi:

- O - mənəm! Səfehlər, siz ucuz ölümə də layiq deyilsiniz, mən öldürmək üçün burada deyiləm. Ona görə də bu azadlığı sizə ithaf edirəm. Siz də qaçın, qaçın qurtulun, bədbəxtlər! Vaxt yetişib daha burada qalmağa ehtiyac yoxdur, mən getdim!..

Məni hər yerdə axtarırlar, hamısı da sizin kimi adamlar. Siz də axtarın məni, ancaq sabah qəzetlərdə oxusam ki “Sehrbaz qaçdı”, bax, onda vay halınıza! Eşitdiniz də məni?!

Cavab gözləmədən bəyaz nura qoşub gözdən itdi.

***Bakı,***

***29 iyul-13 avqust, 2013-cü il***

**POEZİYA**

## Məmməd İBRAHİMLİ



İbrahimov Məmməd İbrahim oğlu 1954-cü il sentyabrın 2-də Laçın rayonunun Oğuldərə kəndində anadan olub. Sadə kənd həyatı yaşayan Məmməd İbrahimli gənc yaşlarından yaradıcılıqla məşğul olub. Şeirləri "Laçın" qəzetində və digər mətbu orqanlarda işıq üzü görüb.

Ermənilər Laçın rayonunu işğal edəndən sonra Şəki rayonunda məskunlaşıb.

### QALDI

Ömrün ötən günü düşdü yadıma,
Xatirat ürəkdən yanana qaldı.
Vəfalı dostlara can qurban olsun,
Vəfasız əhdini danana qaldı.

Hərə öz varını verər – utanmaz,
Şeytan tutduğunu görər – utanmaz;
Qorxaq gündə on yol ölər – utanmaz,
Satqınlıq, alçaqlıq nadana qaldı.

Heyrətdən donaram kaman dinəndə,
Ürək fəryad edər yaman dinəndə...
Məmməd, bir nazənin dağı sinəndə
Səninlə axirət zamana qaldı.

### YAVAŞ-YAVAŞ

Sən ey yarı yaşı haqlayan ömrüm,
Vaxtdır pillələri çön yavaş-yavaş.
Qayıt həsrət ilə bir bax yollara,
Gənclik qürurundan en yavaş-yavaş.

O vaxt arzularım ətirlənibdir,
İndi can evimə qar ələnibdir.
Nadinc uşaqlığım sehirlənibdir,
O sirli aləmə dön yavaş-yavaş.

Qəlbimi ovutdu bir nazlı mələk,
Dolandım başına pərvanələrtək.
Onda alovluydu sinəmdə ürək,
İndi də közərib sön yavaş-yavaş.

Məmməd, vay halına sənin bu gündə,
Nə qoyub gedirsən elin dilində.
Başını qoyginən haqqın önündə,
Çevir qibləgaha yön yavaş-yavaş.

### CANIM

*Ağa Laçınlıya*

Getdi pir istəklim, geriyə dönməz,
Ha ağla, ha sızla, dərd çəkən canım.
Fələyin zilləti ağır olurmuş,
Leysan buludutək yaş tökən canım.

Dağa arxalanan, a dağsız qalan,
Köməksiz, dayaqsız, arxasız qalan,
Ağalı yaşayıb Ağasız qalan,
Fələk sinəm üstə turp əkən canım.

A Məmməd, vədəsiz solan çox olub,
Nə həyat qurtarıb, nə dövran donub.
Mürgülü baxtımın gözünə dolub
Yoluma yağan qar, çökən çən, canım.

***2010***

### VƏTƏN TAPDAQ, EL DİDƏRGİN, GÜN GÖDƏK...

Acı ruzgar, əsdin Vətən üstünə,
Daha bəsdir, qoşulginən yelə, get.
Ağrı-acı, dəhşət, nisgil gətirdin,
Heç olmasın qayıdışın elə, get.

Elə get ki, daş səpilsin dalınca,
Ərənlərim baş qoyubdu balınca.
Doğma yurdda yağı düşmən qalınca
Onu da öz kəfəninə bələ, get.

Vətən tapdaq, el didərgin, gün gödək,
Murov, Qırxqız göz önümdə qənimtək.
Qara bulud, nə dolmusan mənimtək,
Göz yaşını o yerlərə çilə, get.

Harda olub belə qəsdlər, talanlar,
Məmməd, bizi yurdsuz qoydu nadanlar.
Vətənimdən məni qərib salanlar,
Səni də öz vətənindən belə get.

### ÇALBAYIRDAN ƏSƏN KÜLƏK...

Çalbayırdan əsən külək, ötən meh,
Nə olardı, bizə sarı əs barı.
O dağların, çiçəklərin ətrini
Yetir bizə, sən eyləmə qəsd barı.

Azalmadı nisgilimiz, ağrımız,
Aman Allah, yaman çaşıb ağlımız.
Aran yerdə şan-şan oldu bağrımız,
Harda qaldı mərhəmətin bəs barı?

Məmməd müjdə gözləyir bu səhər də,
Ömür keçdi qəriblikdə, qəhərdə.
Ey Yaradan, əlac eylə bu dərdə,
Ya yet dada, ya ümidi kəs barı.

**POEZİYA**

**Humay ÖZLƏM**



### MƏNİ MƏHƏBBƏTLƏ BİRGƏ DƏFN EDİN

Bu sevgi qəlbimi sökdü, taladı,
Köksümdə sönməyən ocaq qaladı.
Ömrümə bir başqa ömür caladı,
Məni məhəbbətlə birgə dəfn edin.

Məhəbbət şeirdir, bəstəsiyəm mən,
Məhəbbət çiçəkdir, dəstəsiyəm mən.
Məhəbbət loğmandır, xəstəsiyəm mən,
Məni məhəbbətlə birgə dəfn edin.

Məhəbbət hər kəsin ehtiyacıdır,
Məhəbbət dünyanın şahlıq tacıdır.
Məhəbbət min dərdin tək əlacıdır,
Məni məhəbbətlə birgə dəfn edin.

## TƏZƏDƏN SEVƏK...

Təzədən başlayaq eşqi, təzədən,
Birgə vuran iki qəlbin xətrinə.
Təzədən başlayaq eşqi, təzədən,
Dünyamız bürünsün çiçək ətrinə.

Təzədən başlayaq eşqi, təzədən
Qəlbimiz sevgiylə döyünsün yenə.
Təzədən başlayaq... elə bu gündən,
Mən sənə vurulum, sən də ki mənə.

Təzədən başlayaq eşqi, təzədən,
Gözümüz yollardan yığılsın daha.
Sevmək günahdırsa, olsun, əzizim,
Gəl təzədən bataq bir də günaha.

Təzədən başlayaq eşqi, təzədən,
Sevənlər qorusun öz qismətini.
Ayrılıq sevgidə bir adətdirsə,
Biz pozaq dünyanın bu adətini.

## ƏGƏR DÜNYADA OLMASAN

Lay buludlar yerə enər,
Ömrümün çırağı sönər.
Okeanlar gölə dönər,
Əgər dünyada olmasan.

Quşlar qanad açıb uçmaz,
Ağaclar da çiçək açmaz.
Günəş yerə işıq saçmaz,
Əgər dünyada olmasan.

Sevgi qəlblərdə boğular,
Dünya bir anda dağılar.
Gülər dərdimə yağılar,
Əgər dünyada olmasan.

## YENİDƏN MƏN SƏNƏ QAYIDACAĞAM

Ağlama, bu gediş son gediş deyil,
Yenidən mən sənə qayıdacağam.
Heç şübhən olmasın, bunu dəqiq bil.
Yenidən mən sənə qayıdacağam.

Getdiyim məkanda hey səni anıb,
Ruhunu özümlə birlikdə sanıb.
Eşqinlə odlanıb, alışıb, yanıb,
Yenidən mən sənə qayıdacağam.

Gözünün önündən əksim getməmiş,
Arzu, istəyinə tamam yetməmiş.
Hicranın, həsrətin sonu bitməmiş
Yenidən mən sənə qayıdacağam.

Özləməm, eşqindir məni yaşadan,
Tanrı bu sevgini etsin başacan.
Sən mənə can desən, mən də sənə can,
Yenidən mən sənə qayıdacağam.

## ÖLMƏRƏM

Bax... Yenə də yağır bahar yağışı,
Yazılır göylərə sevda naxışı.
Axsa da səninçün gözümün yaşı,
Qəlbimi buluda qatsam, ölmərəm.

Bahar bulududək boşalıb dolsam,
Həsrətindən hər gün saralıb solsam.
İllərlə, aylarla yuxusuz qalsam,
Bir gün qollarında yatsam, ölmərəm.

Ömrümü həsrətlə vururam başa,
Arzular, xəyallar dəydikcə daşa.
Baxma gözlərimdən yağan yağışa,
Səninçün sularda batsam, ölmərəm.

Özləməm, ürəyim kamantək kövrək,
Ömrümə, günümə təkcə sən gərək.
Tükənsə nəfəsim, dayansa ürək,
Son anda əlimdən tutsan, ölmərəm.

**BİZƏ YAZIRLAR**

## *ATAM HAQQINDA QISA BİOQRAFİK TANITIM*

*Abdullayev Rüstəm Hüseyn oğlu Laçın rayonunun Abasqışlağı kəndində (Güləbird sovetliyi) doğulmuşdur. O, kənd təsərrüfatı mütəxəssisi olub və rayon kənd təsərrüfatı idarəsində 1940-cı ildə hərbiyə çağırılana qədər atçılıq üzrə zootexnik vəzifəsində çalışmış, Böyük Vətən Müharibəsinin (1941-1945-ci illər) iştirakçısı olmuşdur. Ukrayna ərazisində döyüşlər zamanı yaralanaraq əsir düşmüş, sonda əsirlikdən qaçaraq əvvəlcə Ukraynanın Vinnitsa vilayətində, sonradan isə Leninqrad vilayətində partizan dəstəsinə qoşulmuş və hərbi xidmətini Almaniyada başa vurmuşdur. Bir neçə medalla və Ali Baş Komandanın təşəkkürü ilə mükafatlandırılmışdır. Partizanlıq fəaliyyəti haqqında Sankt-Peterburqdakı Smolnı partizan hərəkatı muzeyində sənədlər vardır.*

*1951-ci ildə avtomobil qəzasında həlak olmuşdur.*



*Sankt-Peterburqdakı Smolnı partizan hərəkatı muzeyində 1999-cu ildə atamın şəklini və haqqında məlumatları görəndə böyük qürur hissi keçirmişəm. Onun yarımçıq ömrü nəinki mənim, bütün qohum-əqrabanın, dost-tanışın kədərinə çevrilmişdir. Müharibəyə getdiyi birinci gündən həlak olduğu günə qədər yazdığı gündəliyi və evimizdə olan bütün fotoşəkilləri işğaldan çıxarmışam.*

*Atamın gündəliyindən bəzi hissələri, hərbi formada olan fotosunu "Laçın yurdu"nda çap etdirmək istəyi ilə Sizə göndərirəm.*

*Hörmətlə:* ***Qəzənfər HÜSEYNOV***

**AXTAR BABALARI**

## Abdullayev Rüstəm Hüseyn oğlunun gündəliyindən...

...1938-ci ildə hərbiyə çağırıldım. Çalışdığım sahədə vacib olduğumu nəzərə alaraq məni bir il çağırışdan təxirə saldılar. 1939-cu ildə sevimli yoldaşlarım olan Əkbər Hacıyev, Əbülfəz Əliyev və Bulud Şirinov əsgərliyə getdilər. 1940-cı ilin fevral ayında məni yenidən hərbiyə getmək üçün çağırdılar. Rayon hərbi komissarı Vəli Əliyev hərbiyə yaxşı at seçdiyimə görə

məni bu dəfə də hərbiyə göndərmədi. Həmin ay atların hərbiyə seçilməsi üçün çox ciddi çalışdım. Amma nə qədər çalışırdımsa yaxın yoldaşlarımın əsgərliyə getməsi, mənim qalmağım mənə heç cürə rahatçılıq vermirdi. Dəfələrlə hərbi komissarlığa müraciət etsəm də nəticəsi olmadı.

Nəhayət, 1940-cı il mart ayının 7-də gündüz saat 3-də idarədə iş zamanı rayon hərbi komissarlığından zəng edib mənə dedilər ki, hazırlaş, axşam saat 6-da avtomaşınla əsgərliyə gedəcəksən. Sevincək idarənin bütün işlərini təhvil verib, ailəmizlə vidalaşmaq üçün evə getdim. Atam məni yola salmaq üçün mənimlə komissarlığa gedəcəyini bildirdi, anam ağlayaraq evdə qaldı, mən isə sevinərək hamı ilə vidalaşdım. Axşamın qaranlıq hissiyyatı "Lesoqorsk" dağlarını bürüyür, mən "Zis" markalı yük avtomaşının kabinəsində atamın dostu Məmməd Məlikovla yanaşı oturub dağlarımızı gözdən keçirərək, sanki onlarla vidalaşırdım, bu dağları bir də görməyə çətin ümid edirdim. ***Çünki bir insanın ölümü çox da çətin deyil!***



Mart ayının 7-də gecə yarısından bir az keçmiş Yevlax rayonuna çatdıq. Həmin gecə qatar olmadığı üçün gedib həmyerlimiz Mina Verdiyevagildə yatıb dincəldim və ayın 8-də qatarla yola düşdük. Qatar bizi Azərbaycan torpağından uzaqlaşdıraraq Ukraynaya çatdırdı. Mart ayının 25-də Ukraynanın Rovno vilayətində yerləşdik.

Aprel ayında biz əsgərləri hərbi geyimlə təmin etdilər. 150 nəfərə qədər azərbaycanlı düşdük artileriya polkuna. Biz azərbaycanlılardan 2-3 nəfər, o cümlədən mən rusca az da olsa bilirdik. Amma düz olub-olmamasına fikir vermədən danışırdım. Laçın rayonundan olan əsgər yoldaşlarım mənim xatirimi çox istəyirdilər. Çünki mən onlara tərcüməçilik etməklə, həm də onları müdafiə edir, tələb ediləni onlara anladır və bütün şəraiti onlara başa salırdım.

1939-cu ilin avqust ayından kommunist partiyasının üzvü olduğum üçün məni dəfələrlə hərbi məktəbə oxumağa göndərmək təklif etsələr də mən imtina edirdim. Hər bir əziyyətə hazır idim, təki 2 il xidmətim başa çatsın, ancaq evə dönməyi fikirləşirdim. Çünki ailəmiz böyük idi, qayğılar heç vaxt yadımdan çıxmırdı.

Aradan bir neçə ay keçdikdən sonra məni topun I nişanlayıcısı vəzifəsinə təyin etdilər. Bu vəzifə lap ürəyimdən idi.

1940-cı ilin yay fəslində Rovno vilayətindən yay düşərgəsinə getdik. 54-cü polkun II batareyasında xidmət edirdim. Yay düşərgəsi vaxtı sona çatdığı zaman, yəni payızda Rumıniya sərhədinə gələrək, Şimali Bukovinanın

və Bessarabiya torpaqlarının rumınlardan azad edilməsində iştirak etdik. Bizim polk Çernovtsı şəhərində dayandı. Həmin ilin noyabr ayında orta savadlılardan imtahan götürərək, bizə rütbə verdilər. Biz söz verdik ki, 2 il xidmətdən sonra mülki həyata dönəcəyik. Dekabr ayında bütün orta təhsilliləri Kiyevdə yeni təşkil edilmiş 64-cü polka göndərdilər. Kiyevə gedən 30 nəfərdən 5 nəfərə, o cümlədən 2 nəfər azərbaycanlıya komandirlik səlahiyyəti verdilər. Mən həmin polkda I batareyaya düşdüm, yeni gəlmiş əsgərləri qəbul edərək I topun komandiri olmaqla, I bölüyün komandir müavini kimi fəaliyyətə başladım.

Bizim diviziya Kiyev şəhərinin hərbi hospitalının nəzdində olduğu üçün ərzaq və s. təminatımız olduqca yüksək səviyyədə idi. Evdən atam və qardaşım Təvəkgül mənə pul göndərdikləri üçün maddi vəziyyətim olduqca yaxşıydı, boş vaxt da tapırdım. 25 nəfər əsgər və 25 baş at mənim ixtiyarımda idi, zabit və əsgərlər arasında böyük nüfuzum vardı.

1941-ci ilin may ayına kimi yaxşı məşğələlər keçdik.

21 iyun 1941-ci ildə gecə bizim polk yay tətili adı ilə eşalon şəklində qatarlara yükləndi. Səhər, yəni 1941-ci ilin iyun ayının 22-də 4 tamamda alman təyyarələri Kiyevi bombardman etməyə başladı. Əsasən şəhərin kənarındakı dəmir yol stansiyasını vururdular. Bizim zenitçilər də düşmən təyyarələrini artileriya atəşi ilə qarşıladı. Bizim 64-cü polk eşalonla qərbə doğru yola düşdü. Yolda topun üstündə evə məktub yazdım ki, "hələlik xudahafiz, mən getdim cəbhəyə, sağlıq olsun görüşərik".

Bir neçə gündən sonra cəbhəyə çataraq, Yanpol şəhərinin kənarında atəş mövqeyi tutduq. Güclü yağış işimizi lap çətinləşdirmişdi, müdafiə sədləri qazaraq topları "qapalı mövqe"də gizlətdik. Bir neçə yoxlama atəşi açdıqdan, topları silib təmizlədikdən sonra, növbətçi olduğuma görə gecə yatmadığımdan bir balaca yuxulamaq üçün yer axtardım. Bombardman edildiyindən ətrafda olan bütün uçuq-sökük binalar güclü yağış yağdığından damcılıyırdı. Bir örtülü yer tapdım və damcıların altında şirin yuxuya getdim. Təzəcə yuxuya getmişdim ki, əsgərlərim məni oyadaraq faşist tanklarının üzərimizə gəldiyini göstərdilər. Hamımız sağ tərəfdə olan tankları vurmaq üçün cəld toplara tərəf yüyürərək nişan almaq istədik. Ancaq atəş açmaq mümkün olmadı, çünki tanklar bizim topların nişangahından xeyli kənarda idilər. Topları yenidən nişangaha uyğunlaşdırmağa isə vaxt yox idi. Mən tez başqa hesablaşma apararaq öz topumu gizli qazmadan (okopdan) çıxararaq tankları birbaşa nişana aldım. Mənim topumun nişançısı Ağdam rayonundan olan Mustafa Məmmədov idi, çox cavan uşaq olduğu üçün ona qıymadım, topun yanından qovdum ki, qazmada gizlənsin. Özüm atəş açdım, ancaq yol gəldiyimizə və artileriya nizamlayıcı usta isə topları nizam-

lamadığına görə nə qədər atırdımsa, hədəfi vura bilmirdim. Lakin düşmən tankları bizim yerimizi müəyyənləşdirə bilməmişdi. Nəhayət, topun "panoramasını" çıxararaq birbaşa topun lüləsindın nişan alıb bir tanka atəş açdım. Tankı alov bürüdü. Aradan bir az keçmiş üstümüzə 15-ə qədər tank gəldi. Eyni üsulla onlara da atəş açmağa başladım. Həmin tanklar yerimizi müəyyən edərək atəş açmağa başladılar. Bir də ətrafa baxdım ki, məndən və bölük komandirindən başqa heç kim qalmayıb, hamı geri çəkilmişdi. Biz də atlarımıza minərək geri çəkildik. Keçmiş sərhəddən qayıdaraq, Vinnitsa vilayətinə gəldik və burada yenidən döyüş mövqeyimizi bərpa etdik, yeni top alaraq müdafiədə dayandıq. Onu da qeyd edim ki, dincəlməyə vaxt olmurdu, gecə-gündüz yuxusuz idik.

1941-ci il avqust ayının 1-də XII ordunun bir neçə diviziyası ilə birlikdə bizim 64-cü artileriya polku da mühasirəyə düşdü. Avqust ayının 18-nə kimi müdafiədə döyüşdük. Həmin gün günorta 76 mm topla birbaşa nişanla atırdıq. Topun üstündə günorta nahar yediyimiz vaxt bir düşmən minası topdan təxminən 30 metrlikdə yerə düşüb partladı. Qəlpələr sağ ayağımı iki yerdən yaraladı. Düşmənin hücumu bizi pərən-pərən salmışdı. Yaralı halda bir quyuda qalmışdım. Üç gün belə qaldıqdan sonra bütün əsgərlər Vinnitsa vilayətinin bir kəndində bir yerə toplaşdıq ki, yol taparaq Sovet Ordusu sıralarına birləşək. Biz olan kəndə almanlar daxil olub bizim hamımızı əsir götürdülər.

Avqust ayının 25-26-sı Vinnitsa əsir düşərgəsinə gətirilərkən orada ən azından 5 min nəfərədək zabit və əsgərlərin olduğunu gördüm. Burada hər millətdən əsirlər var idi. Burada əsirləri döyür, güllələyir, kim bilir nə etmirdilər. Özbək millətindən polisaylar təşkil etmişdilər. Onlar əllərində bir metrə qədər uzunluğunda bərk rezinlə düşərgədə gəzir və əsirləri döyürdülər. Biz yaralılar sanitar hissədə saxlanırdıq, on gündə bir dəfə sarğılarımızı dəyişəndə sevinirdik. Ukraynalı qadınlar yeməyə nə gətirsələr onu verirdilər, yəni gündə 150-200 qram çörək. Vəziyyət olduqca dözülməz idi, hər gün yaralılardan və sağlardan ölənlərin sayı çoxalırdı. Ayağımın sağalması iki ay çəkdi. Məni belə zəif bir vəziyyətdə göndərdilər sağların içərisinə. Bir neçə ay düşərgədən əsirlərlə birgə bizi işləməyə aparırdılar. Gündə yeməyə 200 qram çörək və 2 dəfə də "balanda" ("balanda" – yem çuğundurunun yarpaqları və soyulmamış kartofun qaynatmasına deyirlər) verirdilər. Bu yemək isə zəif adamları dərhal dizenteriya xəstəliyinə salırdı. Axşamlar min nəfərədək əsir bir barakda yatırdı, 4-5 aydır ki, hamam görmürdük. Gecə küləşin üstündə bədənimizə daraşan bitləri qova-qova bir təhər yatmağa çalışırdıq. Qarın ac, fiziki iş, cır-cındır paltar, soyuq hava və ölməmək üçün

yaşamaq çox çətin idi. Ancaq üzümüz bərk idi, çalışırdıq ki, ölümdən xilas olaq.

Bir gün mən belə yaşamağın mümkün olmadığı üçün çıxış yolu axtarmaq haqqında fikirləşib belə qərara gəldim ki, yemək şəraitimi yaxşılaşdırmaq üçün çalışmalıyam. Bir yaxşı əsgər şinelim var idi, onu 150 rubla satıb bir çörək və s. ərzaq aldım. Sonra özümə bir ucuz şinel aldım, kiçik bir alverə başladım və yemək məsələmi qismən yaxşılaşdırdım. Ancaq faşistlərin bizi döyməsi və onlara oxşayan bitlər rahatçılıq vermirdi. Qarşıma məqsəd qoydum ki, iş vaxtı qaçam yaxındakı kəndə. Ancaq yerli əhalidən fərqləndiyimə görə risk etməkdən qorxurdum ki, məni tutub asarlar.

Bir gün işə gedərkən əslən Laçın rayonunun Qarıqışlaq kəndindən olan Mehrəliyev Soltan adlı bir oğlanla tanış oldum. O, tez-tez kəndə qaçması və orada necə yaşaması haqda mənə söhbət edəndən sonra qəti qərara gəldim ki, onunla birgə qaçım.

1941-ci il dekabr ayının 22-si axşam saat 5-də iş vaxtı Vinnitsa adlı əsir düşərgəsindən qaçdıq. Küçələri dəyişə-dəyişə özümüzü kəndin kənarında bir yeraltı qazmaya yetirib, axşam saat 8-ə kimi orada gizləndik. Axşam qaranlıq düşən kimi 6-7 saat yol gedib bir kəndə çatdıq. Bu kənd "Mizakiyevskiy xutor" adlanırdı. Gecə yatmaq üçün dəyirmana daxil olduq. Bu gecə sanki bizə Sibir katorqası oldu. Ayaqqabımın bir tayı ayağımı sıxır. Yeri gəlmişkən yazmaq istəyirəm, üzr istəyirəm, unutmaq çox çətindir, neçə aydır ki, alt paltarı dəyişmək, hamam nə olduğunu bilmirik. Bütün bədənimizdə cücülər gəzişir, qaşınma yatmağa imkan vermir.

Nəhayət səhər açılır. Soltan ilə düşdük kəndin küçələrinə, qapı-qapı gəzib yemək istəyirik (dilənmək də demək olar). Mən utandığımdan heç bir evə daxil ola bilmirəm, ancaq Soltan sağ olsun, həyətləri gəzərək çörək, alma-armud qurusu, bulka və s. gətirib məni də dolandırırdı. Bir gün belə dolandıq, səhəri mən Soltana bəyan etdim ki, belə dolanmaq olmaz, ev tapmaq, işləmək lazımdır. Üz qoydum starostanın (kənd soveti sədri) yanına, xahiş etdim ki, mənə iş versin. Nə sənətim olduğunu soruşdu. Əvvəl "heç bir sənətim yoxdur", sonra zootexnik lazım olmaz, – deyə "mal həkimiyəm" dedim. O mənə məktub verib, kəndin baytarının yanına göndərdi. Baytarı yerində tapmayıb, gecə düşdüyü üçün yatmağa yer axtarmağa başladım.

Qarşıma çıxan bir naxırçıdan mənzil tapmaqda mənə kömək etməsini xahiş etdim. O, məni Adaqra Saroqa adlı bir qadının yanına göndərdi. 50-55 yaşlı qadına kənddə həkim işləyəcəyimi deyib, yaşamaq üçün ev axtardığımı söylədim. Adaqra razı olub evlərini mənə göstərdi, kasıb olduğunu dedi və məni ancaq starostanın vasitəsi ilə evə buraxacağını bildirdi. O, mənə bu gecəliyinə başqa bir evdə – Qrişa adlı bir oğlanın evində qalmağı

məsləhət gördü və evi mənə göstərdi. Qrişanın evinə tərəf gedəndə Adaqra qonşularına deyir ki, doktor gəlmişdi, sabahdan mənim evimdə qalacaq. Həmin qonşulardan biri yıxıldığından ayağı çıxmışmış. Nə üzrə doktor olmağımı başa düşmədən mənim arxamca adam göndərirlər. Qrişanın evinə çatmamış arxadan səs eşidib, geriyə dönərkən bir azyaşlı qızın mənə tərəf yüyürərək gəldiyini gördüm. Qız "dyadya sizi bizim evdə gözləyirlər" dedi. Qorxa-qorxa onlarda kimlərin olduğunu soruşdum. O, kənar adamların olmadığını bildirdi: "atam xəstə olduğu üçün sizi çağırırlar". Evə daxil olarkən qızın atasının ayağının çıxdığını gördüm. Müalicəni bacararam deyib, dərhal işə başladım. Axşam qaranlıqda mümkün olmadığı üçün lazım olan ağacları yonub işi sabaha saxladım.

Yaxşı bir süfrə açdılar. Mən isə xeyli vaxtdır ki, yuyunmadığımı bildirdim. Yuyunub, paltarlarımı dəyişib xeyli rahatlandım. Səhər tezdən kişinin ayağını "çarxa" verib, çıxığı yerinə saldım. Kişi dərhal rahatlandı və şirin yuxuya getdi. Düz 15 gün məni qonaq saxladılar. Sonda nəhayət ki, donuzçuluq fermasında işə düzəldim. 1942-ci ilin yazına kimi orada çalışaraq, Adaqra Saroqanın evində qalırdım. Yazda öz adamlarını təyin edib, məni işdən azad etdilər. Nəhayət, yazın axırında, yayın əvvəllərində almanlar düşərgədən qaçan əsirləri tutmaq üçün hərəkətə gəldilər.

Adaqra məni evində bir müddət gizlədəndən sonra başa düşdüm ki, belə gizlənməklə yaşamaq mümkün deyil. Qonşu Jitomir vilayətində partizan dəstələrinin olduğunu eşidib yol üçün ərzaq tədarük etdim, Adaqra ilə halallaşaraq meşə yolu ilə Jitomirə tərəf yola düşdüm. Rus və Azərbaycan dillərində alman faşistlərinin məhv olmasını arzulamaqla evə halallaşma məktubu yazıb Adaqraya verdim ki, bir yol tapıb məktubu göndərsin.

Yolda çox əziyyətdən sonra, 10-15 gün yol gedərək nəhayət ki, partizan dəstəsini tapıb özümü təqdim etdim. Dəstənin komandirinin əslən bakılı olan Məmmədov soyadlı bir azərbaycanlı olduğunu bildim. Onunla görüşüb tanış oldum. Mənim partizanlığa gəlməyimə çox sevinərək burada tək olduğunu bildirdi. Bir neçə gündən sonra sayımız 28 nəfərə çatdı. Cəmisi 5 ədəd tüfəngimiz, olduqca az gülləmiz vardı. Bir balaca çətinə düşən kimi başqa meşəyə qaçırdıq.

Bir gün Məmmədov bir neçə nəfər partizanla magistral yolda pusqu qurub gözləyir. Bir alman generalı 2 nəfərin müşayiəti ilə minik maşınında meşə yolu ilə cəbhəyə gedərkən pusquya düşür. Onları məhv edib avtomobili, sənədlərini və paltarlarını meşəyə gətirdilər. Məmmədov Sovet Ordusunun podpolkovniki olmuşdu, alman dilini səlis bilirdi. Həmin gün o, 2 nəfər partizana alman əsgərlərinin, özü isə generalın paltarlarını geyinərək Jitomir şəhərində yerləşən əsir düşərgəsinə getdi.

Məmmədov düşərgənin rəisi ilə danışıqlar apararaq cəbhə arxasında yol-tikinti işləri görmək məqsədi ilə 200 nəfər sağlam əsir seçir, ondan bir ədəd radio verici cihaz da alaraq yük avtomobili ilə onları yola salır. Özü isə qalaraq aldıqlarına dair düşərgə rəisinə qəbz verir.

Həmin gecə Məmmədov Moskva ilə əlaqə saxlayaraq koordinatları verərək lazımı köməklik istədi. Gecə saat 12-dən 3-dək paraşütlə bizə avtomat silah, əl pulemyotu, güllə və s. sursat, ərzaq tulladılar.

Olduqca qüvvətli bir partizan birləşməsinə çevrildik, üstümüzə nə qədər düşmən qüvvəsi gəlsə də geri oturduldu. Bu ərəfədə mən tapşırıq üzrə Leninqrad partizan dəstəsinə kəşfiyyatçı işinə göndərildim.

1944-cü il mart ayının əvvəlində Leninqrad cəbhəsindən alman faşist birləşmələrinə ilk güclü zərbə oldu. Nəticədə Qızıl Ordu almanları bütün cəbhəboyu geri qovdu və bizim partizan birləşməsi ordu ilə birləşdi. Bizim 5-ci partizan briqadası ağır döyüşlərdən sonra 10 günlüyünə istirahətə buraxıldı. Sonra isə bizi ehtiyat polkuna verdilər, ordu paltarı geyib cəbhəyə getdik.

Mart ayının 28-də ***"Nad Narva"*** adlanan cəbhəyə daxil olduq. Partizan yoldaşlarım Rəcəb Mahmudov (Xaçmaz rayonundan), Əziz Qumanov (Kəlbəcər rayonundan) və başqaları ilə birlikdə artileriya diviziyasına düşdük. Bir neçə gündən sonra biz Finlandiya cəbhəsinə yönəldik. IV zərbə ilə onları arxaya qovduq. Nəticədə sülh müqaviləsi bağlayıb müdafiə mövqeyində dayandıq.

1945-ci il yanvar ayının 5-də Visla çayı üzərindən almanların üzərinə hücuma keçərək, onları Oder çayına kimi qovduq. Bir neçə gün orada müdafiədə dayanandan sonra nəhayət ki, Almaniyanın daxilinə girib müharibəni orada davam etdirdik.

Breslav şəhərinin qərbində Opel şəhərinə girərkən müharibənin QURTARDIĞINI BİZƏ XƏBƏR VERDİLƏR!

Müharibə qurtardığından başımız qarışdı içki içməyə, 2 gündən sonra başa düşdük ki, biz 4 nəfər XIII diviziyadan geridə qalmışıq. Diviziyamız isə Çexoslovakiyanın sərhədinə yaxınlaşmışdı. Bir küçədə atılmış "OPEL" markalı avtomobil görüb, məsləhət etdik ki, minib diviziyaya çataq. Həmin gün axşam saat 5-də mən avtomaşının sükanı arxasına keçdim. Gecə diviziyaya çatdıq. Avtomaşını bir qapıda saxlayıb yatdıq. Səhər tezdən diviziyaya gedərkən batalyon komandiri Karpov məni yanına çağıraraq onunla "polutorka" maşınında getməyi əmr etdi. Mən isə ona "OPEL" avtomobili gətirdiyimi bildirib, onunla getməyi təklif etdim. 4 nəfər mənim gətirdiyim avtomobilə əyləşib Çexoslovakiyaya çatdıq. Çexlər bizi çox yaxşı qarşıladılar. Bizim ordu kalonu keçdikcə onlar "nadzar" deyərək qışqırırdılar.

8 ay həmin "OPEL"də sürücülük etdim. Sonra isə batalyonun tibb sanitar inspektoru vəzifəsində çalışdım. Özümün "DKV" markalı motosikletim oldu, batalyonun sanitar inspektoru olmaqla müəyyən məntəqələrə təhkim edilmişdim. Vəzifəmdən olduqca razı idim. Müəyyən səbəblərə görə məni ehtiyat polka göndərdilər və mən Breslav hərbi komendaturasında çalışmağa başladım.

1945-ci ilin noyabr ayında evə məktub yazdım, ancaq evdən məktublarıma cavab gəlmirdi. Düşünürdüm ki, poçt xidməti pozulduğundan məktublarım evə çatmır.

Artıq 1915-ci ildə anadan olub, 3 dəfə yaralananları ordudan tərxis etməyə başlamışdılar. Mən isə sənədlərə əsasən 1916-cı ildə anadan olmaqla, iki dəfə yaralanmışdım. Evə məktub yazdım ki, kənd təsərrüfatı texnikumunu zootexnik ixtisası üzrə bitirməyimə dair mənə arayış göndərin. Bu arayışı almağı səbirsizliklə gözləyirdim, çünki onun əsasında məni ordudan tərxis edərdilər.

1945-ci il noyabr ayının 28-də biz kiçik komandirləri ehtiyat polkuna göndərdikləri üçün səhər tezdən hərbi komendaturadan çıxmalı olduq.

Səhəri gün saat 10 tamamda nəhayət ki, evdən məktub aldım, açaraq içindəki arayışları götürüb sevincək ehtiyat polka gəldim. Çalışdım ki, tez sənədlərimi rəsmiləşdirib evə gedəm.

26 dekabr 1945-ci ildə Breslav şəhərindən şərqə doğru eşalonla yola düzəldik. 2 yanvar 1946-cı ildə Moskvaya çatdıq.

Yanvarın 7-də gecə saat 5 tamamda Ağdamda atamın yaxın dostu, əmi sayıb, sevdiyim Hüseynqulu Babayevin evinə daxil oldum. Səhəri gün, yəni yanvarın 8-də Hüseynqulu əmi Laçına, atama mənim burada olduğumu xəbər verdi. Atam dərhal Ağdama gəldi. Artıq 7 ildir görmədiyim atamla necə görüşdüyümü yəqin ki, təsəvvür edərsiniz. Yanvarın 9-da qardaşım Təvəkgül Ağdama gəldi. Bu 3 gün Hüseynqulu əmi bizi buraxmadı, şərəfimizə qonaqlıqlar verdi.

Yanvarın 10-da avtomaşınla Laçına doğru yola düzəldik. Nəhayət, axşam saat 7-də Laçına çatdıq. Evə daxil olarkən şəhərdə olan bütün qohumları, dostları gördüm, bütün günü məni gözləmişdilər. Qardaşım Sabiri evdə xəstə görəndə əhvalım pis oldu. 3 gün toy səviyyəsində qonaqlıq edildi...

19 sentyabr 1946-cı ildə Şəfiqə Həsənəli qızı Baxışova ilə ailə həyatı qurdum...

**POEZİYA**

## Arif PƏNAHOĞLU



Mikayılov Arif Pənah oğlu 6 sentyabr 1971-ci ildə Laçın rayonunun Qoşasu kəndində ziyalı ailəsində dünyaya gəlmişdir. Atası Pənah Mikayılov Laçın rayonunda və eləcə də respublikada tanınmış şair, respublikanın qabaqcıl maarif xadimi idi.

Gözəl səsə malik olan Arif uşaq yaşlarından musiqiyə maraq göstərmiş, müxtəlif muğam festivallarının qalibi olmuşdur. Lakin xəstəlik nəticəsində səsini itirmiş, musiqiyə olan marağı onu tara bağlamışdır.

Şuşa şəhərində musiqi kollecinə qəbul olunmuş, hərbi xidmətdən qayıdandan sonra təhsilini Sumqayıt şəhərində tamamlamışdır.

Vətən həsrəti, qəribçilik həyatı onu şeir yazmağa vadar edib. Atasının sənətini yaşatmağı özünə mənəvi borc bilir.

Hal-hazırda Ukraynanın Donetsk vilayətində yaşayır.

### GƏL MƏNİ ÖZÜNLƏ SAYMA BƏRABƏR

***Mənə "bəsdi dərddən, qəmdən yazdın, mövzuları dəyiş, nikbin ruhda yaz" – deyən yaxın dostuma...***

Yolum qarlı yoxuş, ayağım yalın,
Tale yazısıdı bəxtin, iqbalın.
Soruşdun, söyləyim könlün əhvalın,
Tükənir, qalmayır yurdsuzda təpər,
Gəl məni özünlə sayma bərabər.

Həmdəmim qəm olub, yoldaşım ələm,
Ürəyin çəkdiyin köçürür qələm.
Yanıb qaralmışam, soyuyan küləm,
Könlüm evi dağılıbdı dərbədər,
Gəl məni özünlə sayma bərabər.

Mənimki həsrətdən gəlir, yazıram,
Qəm-kədər qəlbimi dəlir, yazıram.
Gözümün yaşını silir, yazıram,
Gəlir dərd üstünə dərdlər sərasər,
Gəl məni özünlə sayma bərabər.

Sən sevgi şairi, eşq şairisən,
Həyatın görməsin nə qüssə, nə qəm.
Sənə layla çalır qoynunda Vətən,
Qəriblik qürbətdə ruhumu didər,
Gəl məni özünlə sayma bərabər.

Arifəm, nə verdi bu həyat mənə?!
Əzdi varlığımı dəmir məngənə.
Məni tanıyana, məni bilənə
Ömrüm faciəli dəhşətli əsər,
Gəl məni özünlə sayma bərabər,
Gəl məni özünlə sayma bərabər.

## QARABAĞLIYAM

Qəlbdə ulu Allah, din islam dini,
Özüm azəriyəm gördüyün kimi.
Muğam dünyasının xəstə sakini,
Qarmona, kamana, tara bağlıyam,
Əslim Laçınlıdır, Qarabağlıyam...

Nə müddətdi tərk etmişəm Vətəni,
Qəriblik yamanca kövrəldib məni.
Xəstə ürək xəstə salıb bədəni,
Möhlət sıxır, məcbur edir ağlıyam,
Əslim Laçınlıdır, Qarabağlıyam...

Tale məni qismət edib gör hara?!
Nə vaxtdı həsrətəm o yaylaqlara.
İstərdim qoşulub buz bulaqlara
Eləcə süzüləm, axam çağlayam,
Əslim Laçınlıdır, Qarabağlıyam...

Yar olmadı, bəxtim mənə doğrusu,
Talesizin Tanrıdan nə arzusu?!
Doğulduğum doğma kəndim Qoşasu,
İsmi Arif, soyu Pənahoğluyam,
Əslim Laçınlıdır, Qarabağlıyam...

## DÜNYANIN

Baş açmaq çətindir, anlamaq olmur,
Fanidir işləri fani dünyanın...
Öldürür günahsız, suçsuz kəsləri,
Verilmir cəzası cani dünyanın...

Min sirli aləmi, min hikməti var,
Söylə bu işlərdən kimlər baş açar?!
Kimisi toy edər, kim yasa batar,
Gah aldır, gah qara donu dünyanın...

Kimisinin qara yazır bəxtinə,
Kimisin qaldırır şahlıq taxtına.
Fəqət məruz qalır əcəl vaxtına,
Nökəri, ağası, xanı dünyanın...

İstər yaxşı yaşa, xoş keçsin çağın,
İstər zülmət olsun həyat növrağın.
Hamı möhtacıdır beş arşın ağın,
Əzəldən belədir sonu dünyanın...

Arifəm, olmuşam zaman xəstəsi,
Könlüm həzin laylaların bəstəsi.
Sönüb gözdə, yaşamağın həvəsi,
Dəyişib dövranı, anı dünyanın...

## AXTAR BABALARI



### 72 il əvvəl müharibəyə yollanmış atasının məzarını 80 yaşında tapdı...

Laçın rayonunun Ağanus kənd sakini, rayon Ağsaqqallar Şurasının sədri, respublikanın əməkdar müəllimi Ağayar İsmayılov II Cahan müharibəsində itkin düşmüş hesab edilən və 1944-cü ildən bəri haqqında dəqiq məlumat bilinməyən atası Sultan Əbdüləlibəy oğlu İsmayılovun məzarını 72 il sonra Ukraynanın Xerson vilayətinin Veliko Lepetixo

rayonunun Maloye Lepetixo kəndində tapıb. Faşizmə qarşı müharibədə həlak olmuş S.Ə.İsmayılov haqqında məlumatların toplanmasında və dəfn edildiyi yerin müəyyən edilməsində Azərbaycan Veteranlar Şurası sədrinin müavini Kamal Əliyevin, Ukraynanın Çerkassı vilayətinin Smela şəhər Veteranlar Şurasının böyük dəstəyi olmuşdur.

80 yaşlı Ağayar İsmayılov 72 il əvvəl ayrıldığı atasının məzarını ziyarət etmək üçün qatar və avtomobillə 3000 km-ə yaxın məsafə qət etmişdir. Maloye Lepetixo kəndinin icra nümayəndəliyi və sakinlər doğma kəndləri uğrunda canını qurban vermiş azərbaycanlı oğulun atasını böyük hörmətlə qarşılamış, məzarlığın ziyarətini təşkil etmişlər. Ziyarətdə Ukrayna jurnalistləri də dəvət edilmişdir. Bu barədə Kiyevin mərkəzi "Ukrayna" telekanalı 22 iyul 2013-cü il tarixli "Xəbərlər" proqramının səhər saat 09:00 buraxılışında reportaj vermişdir.

Sultan Əbdüləlibəy oğlu İsmayılov 1911-ci ildə Laçın rayonunun Ağanus kəndində anadan olmuş, keçən əsrin 20-ci illərinin sonunda Quba müəllimlər seminariyasını bitirmiş, bir müddət Laçının və Kəlbəcərin ucqar kəndlərində müəllim işləmişdir. 1941-ci ilədək Laçın rayon mərkəzində rəhbər vəzifələrdə çalışmışdır.

1941-ci ilin iyununda iki oğlunu və iki qızını qoca atasının himayəsində qoyaraq II Cahan müharibəsinə yollanmış S.Ə.İsmayılov 1943-cü ilin payızına qədər İrana göndərilmiş Sovet qoşunları tərkibində Güney Azərbaycanda xidmət etmiş, sonra Şimali Qafqaza aparılmış və Mozdok uğrundakı döyüşlərdə yaralanmışdır. Sağaldıqdan sonra isə Ukrayna cəbhəsinə göndərilmişdir. Və 1944-cü il fevralın 15-də Ukraynanın hazırkı Xerson vilayətində, Dnepr çayı yaxınlığındakı Maloye Lepetixo kəndinin azad edilməsi zamanı Hitler faşistlərinə qarşı gedən amansız döyüşlərdə ağır yara almış və 17 fevral 1944-cü ildə – cəmi 33 yaşında hospitalda həlak olmuşdur. Maloye Lepetixo kəndinin azadlığı uğrunda həlak olmuş 343 nəfər ümumi məzarlıqda dəfn edilmiş və adları məzarlığın üzərindəki qranit abidəyə həkk olunmuşdur. Həmin adlar arasında həmyerlimiz, qvardiya baş serjantı, 163 nəfərlik bölüyün komandiri olmuş Sultan Əbdüləlibəy oğlu İsmayılovun da adı var.



Allah rəhmət eləsin!

**S.ŞİRİNBƏYLİ**

**KİTAB RƏFİ**

## “DƏRYADAN BİR DAMLA”




Müxtəlif qəzet və jurnallarda vaxtaşırı şeirləri dərc olunmuş istedadlı şairimiz Bəxtiyar Kavanlı üçün bu il – 2013-cü il çox uğurlu olmuşdur. Belə ki, bu ilin fevral ayında “Payız çiçəkləri” adlı kitabı “Yazıçı” nəşriyyatında çap edildi. Avqust ayında isə “Nərgiz” nəşriyyatında nəfis tərtibatlı, xüsusi dizayn və zövqlə işlənmiş “Dəryadan bir damla” adlı növbəti kitabı işıq üzü gördü. Kitabın redaktoru filologiya elmləri doktoru, professor Məhərrəm Qasımlıdır. Şair-publisist, “Qızıl qələm” mükafatı laureatı Məmməd Elli Təhməzli kitaba ön söz yazmışdır. Topluda müxtəlif inanc və sınamalar, el deyimləri, lətifələr, bayatılar, rəvayət və əfsanələr, tapmacalar, nağıl və hekayələr, həmçinin tarixi şəxsiyyətlərin həyatından yarpaqlar, maraqlı əhvalatlar, etnoqrafiya və digər mövzular cəmlənib. Bu kitab şairin oxucularla sayca dördüncü görüşüdür. Şairin ilk kitabı isə “Ömür vəfa etsə” adlı şeir kitabı olmuşdur.

Bəxtiyar Kavanlının uzun illər zəhmət çəkib ərsəyə gətirdiyi və Laçın uğrunda düşmənlərə qarşı döyüşlərdə şəhid olan həmyerlilərimizin əziz xatirəsinə ithaf edilən “Dəryadan bir damla” adlı kitabını oxuyan insanın xəyalında ilk öncə Laçın torpaqları, sonra isə laçınlılar canlanır. Yeni çap məhsulunun əsas hissəsini şairin müxtəlif illərdə topladığı Azərbaycanın şifahi xalq ədəbiyyatı nümunələrinin cəmi təşkil edir. Kitabda yer alan yazıların əksəriyyətinin toplanmasında laçınlılara arxalanan, onların köməyindən qidalanan Bəxtiyar Kavanlı Azərbaycan folklor nümunələrinin tərkib hissəsi olan Laçın folklorunu kitabda daha qabarıq hiss etdirməyə çalışmışdır.

Kitabda Paşa bəy Sultanovun, Sultan bəy Sultanovun həyatının müxtəlif məqamlarına toxunan maraqlı bölmələr mövcuddur. Həmçinin Şair Məmmədalının, Aşıq Abbas Piçənislinin, şair Səyyah Məhəmmədin, şair Teymur Oğuldərəlinin həyat və yaradıcılığından söhbət açılmaqla yanaşı, onların yaradıcılıqlarından nümunələr də verilmişdir.

Geniş oxucu kütləsi üçün nəzərdə tutulmuş bu dəyərli kitabda cəmlənmiş nümunələrdə vətənə, el-obaya məhəbbət, böyüyə hörmət, elin adət-ənənəsinə inam, müxtəlif fəlsəfi düşüncələr gözəl və səmimi hisslərlə ifadə olunmuşdur.

Qısa məlumat üçün deyim ki, Bəxtiyar Kavanlı 15 sentyabr 1944-cü ildə Laçın rayonunun İpək kəndində anadan olub. İpək kənd ibtidai mək-

təbində ibtidai təhsil, Bülüldüz kənd natamam orta məktəbində natamam orta təhsil, Ərdəşəvi kənd orta məktəbində isə tam orta təhsil almışdır.

Hərbi xidməti başa vuran Bəxtiyar Kavanlı 1970-1975-ci illərdə V.İ.Lenin adına APİ-nin (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) coğrafiya fakültəsində təhsil almışdır. Uzun illər müxtəlif tədris ocaqlarında gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olmuş, "Baş müəllim" adına layiq görülmüşdür. 1964-cü ildə ilk şeiri çap olunan Bəxtiyar müəllimin mətbuatda tez-tez elmi-pedaqoji məqalələri də dərc edilmişdir.

Qeyd edək ki, Qarabağ müharibəsi veteranı, ehtiyatda olan baş leytenant Bəxtiyar müəllim Qarabağ müharibəsinin ilk günlərindən Vətənin harayına hay verənlərdən biri oldu. Hal-hazırda təqaüdçüdür.

**Sultan HÜMBƏTOV**

**PUBLİSİSTİKA**

**İmdad ƏLİZADƏ**



## QÜRBƏTƏ SARI
## (III yazı)

Ətəyindən baxanda sonu görünməyən, yuxarı hissələri qarla örtülü, zəhmli bir dağın – Murovun ətəyində, meşənin qırağında, bulağa yaxın yerdə məskunlaşmışdıq. Hər tərəf yaşıllıq idi. Bura Göygöl qoruğunun ərazisi idi. Ərazidə bizdən başqa da yüzlərlə çadır qurulmuşdu, oba-oba ailələr məskunlaşmışdı.

Yay olmasına baxmayaraq havalar yağışlı, soyuq keçirdi, bir neçə dəfə sulu qar yağdı. Çadırlarda odun sobası qoyulmuşdu. Dəfələrlə sel çadırımızı basmış, bütün əşyalar suyun altında qalmışdı. Güclü yağış yağan bir gecə anam vaxtında yuxudan oyanmasaydı, bizi sel aparacaqdı.

Böyük bir ailənin çadırda yaşaması asan deyildi. Baxmayaraq ki, oğuldərəlilər üçün yayda yaylağa qalxmaq, dağlarda çadır qurub yaşamaq yenilik deyildi. Kənd sakinləri hər il mal-qoyununu yaylağa çıxarırdı, payızda kəndə qaytarırdı.

Murovda isə böyük bir ailə dar alaçıqda, soyuq, yağışlı havada, palçığın içində, axşamlar çıraq işığında yaşamını sürdürürdü. Ən ağırı bizim getməyə, sığınmağa bir yerimizin olmamasıydı. Murovda qurulan alaçıq yaylaq çadırı deyildi, yaşamaq uğrunda mübarizənin bir parçasıydı.

Doğma torpaqlarımıza, evimizə qayıtmaq ümidi bizə çətinliklərə dözmək gücü verirdi. Mal-qoyun saxlayırdıq, meşədən odun qırıb gətirirdik, çətin şəraitdə yaşamımızı davam etdirirdik. Böyüklər Gəncə bazarına mal-qoyun aparıb satır, lazım olan əşyaları, ərzaq alıb gətirirdilər. Atam iki dəfə məni də özüylə Gəncəyə aparmışdı, şəhəri, onun tarixi yerlərini gəzdirmiş, keçmişindən danışmışdı. Bura mənim gördüyüm ilk böyük şəhərdi. Mənə indi də elə gəlir ki, dünyada Gəncədən gözəl şəhər yoxdur.

***

Gözümüz yolda, qulağımız səsdəydi, kəndimizin erməni işğalından azad olunmasını, evimizə qayıdacağımız günü gözləyirdik. Ailələrdən birində el arasında "əl radiosu" adlandırılan radioqəbuledici vardı. Hər gün axşam saat 20-də hamı çadırların ortasında, obanın "mərkəzində" olan böyük daşın ətrafına toplanırdı. Yaxşı eşidilməsi üçün radionu ya daşın üstünə qoyur, ya da bir nəfər əlində tuturdu. "Xəbərlər" başlayanda ortaya sükut çökür, heç kim danışmır, diqqət radioya yönəlirdi. Diktor gur səslə əvvəlcə müharibə xəbərlərini, cəbhə bölgəsindəki döyüşlər haqqında məlumatları oxuyur, Azərbaycan ordusunun cəbhənin hansı istiqamətində düşmənə zərbə endirdiyini, hansı kəndlərin erməni işğalından azad olunduğunu müjdələyirdi.

Azərbaycan ordusunun uğurları haqda informasiyalar böyük sevincə səbəb olurdu. Bu həmin dövr idi ki, milli ordu cəbhədə uğurlu döyüş əməliyyatları aparırdı, Ağdərəni, keçmiş Şaumyan rayonunu, Laçını erməni işğalçılarından təmizləyirdi, hər qarış torpaq uğrunda ağır döyüşlər gedirdi, qan su yerinə axırdı.

Hər gün Xanlardan (indiki Göygöl) Kəlbəcər və Laçın istiqamətində hərbi maşın, ağır texnika karvanları gedirdi. Əsgərlərlə dolu maşınları görən kimi yolun kənarına qaçır, onları salamlayırdıq. Əsgərlər də bizə əl yelləyirdilər. Yol boyu hamının birlikdə mahnı oxuması hərbçilərin döyüşə yüksək əhvali-ruhiyyə, əzmkarlıqla getdiklərini göstərirdi. Hərbi karvan yavaş-yavaş Murova qalxır, gözdən itirdi.

Dövlət qurumlarından isə bizi yada salan, bir dəfə də olsun çadırda yaşayanlara baş çəkən, problemləri ilə maraqlanan yoxuydu. Yalnız bir dəfə meşəbəyi gəlmişdi. Meşədən odun qırmamağı tələb edirdi. Qoruq gözətçisi ilə odun mübahisəsi xeyli davam etdi. Amma heç kim onun dediyinə əhəmiyyət vermədi. Axı bizim başqa yanacağımız yoxuydu.

Yağışlı bir gündə isə Azərbaycan Dövlət Televiziyasından gəlib çəkiliş apardılar, çadırda yaşayanların vəziyyəti haqda reportaj hazırladılar. Dörd

nəfərlik jurnalist qrupu özləri ilə "Astra" siqareti və bir qədər çörək gətirmişdilər.

***

1992-ci ilin yayında Azərbaycan ordusu cəbhədə uğurlu hərbi əməliyyatlar keçirdi, Ağdərənin böyük hissəsini, Laçının bir neçə kəndini, o cümlədən Oğuldərəni erməni işğalından azad etdi. Yayda bir neçə ailə - Kamal Abdulkərimov, Kərəm Abdulkərimov, Möylan Rəsulov, Musa Rəsulov, Yusif İsgəndərov, Cəlal İsgəndərov, Rasim Məcnunov, Cabbar Cabbarov Oğuldərəyə qayıtmışdılar.

Müxtəlif yerlərdə məskunlaşmış oğuldərəlilər tez-tez kəndə baş çəkirdilər. 1992-ci ilin avqust ayında Murovda olan əhali yavaş-yavaş köçürdü. Həmin dövrdə atamla kəndə getmişdim. Murovdan Oğuldərəyə gedənə qədər bir neçə maşın dəyişdik. Kəlbəcərin Tirkeşəvənd kəndində hərbi maşına mindik. "Zil-131" markalı maşının kabinəsində hərbçilər oturmuşdu, kuzova qalxdıq.

Yola bələd deyildim, tez-tez Oğuldərəyə nə qədər qaldığını, nə vaxt çatacağımızı soruşurdum. Kəndə getdiyimə görə sevincimin həddi-hüdudu yox idi. Maşında hərbçilər musiqiyə qulaq asırdılar, maqnitofonda aşıqların ifasında "Baş sarıtel" səsləndirilirdi. İndi də harada "Baş sarıtel" musiqisini eşidirəm, tüklərim biz-biz olur, çiskinli, dumanlı, narın yağışlı bir gündə hərbi "Zil-131" maşının kuzovunda doğma Oğuldərəyə qayıtdığımız gün gözlərimin önündə canlanır.

Axşama yaxın Qorçu kəndinə çatdıq. Qorçu Oğuldərə ilə qonşu kənddir. Maşın Laçın cəbhəsinə gedirdi. Qorçuda maşından düşdük. Qaranlıq idi. Atam dedi ki, burada qohumların birinin evində gecələyək, səhər tezdən Oğuldərəyə gedərik. Etiraz etdim. Oğuldərə ilə Qorçu qonşu kəndlər olsa da, aralarında bir xeyli məsafə var. Yağış yağmışdı, gecə və həm də yol palçıq olduğundan piyada getmək çətin idi. Laçın Rayon Polis Şöbəsinin qərargahı Qorçuda yerləşirdi. Gecə qərargaha getdik, atam Oğuldərəyə getmək üçün maşın istədi, vermədilər. Gecəni Qorçuda qohumların evində qalası olduq.

Səhər açılanda gördüyümüz mənzərə bizi dəhşətə gətirdi. Qorçu altı kəndin mərkəzi hesab olunurdu. Vaxtilə natamam orta və orta məktəb, kənd soveti, kolxoz idarəsi, xəstəxana ancaq bu kənddə yerləşirdi. Hamının yolu bu kənddən düşürdü. Ona görə də Qorçuya hamı doğma evi kimi baxırdı.

Namlı və Qorçu çaylarının arasında yerləşir bu kənd. Qorçu çayının kəndlə üzbəüz sahilində meşə zolağı uzanır. Aşağı tərəfdə də nəhəng ağac-

ları, dadlı meyvələri olan meşəlik var. Bu meşənin qırmızı palıdı dünyada məşhurdur. Babamın anası, nənəmin anası bu kənddəndir.

Babamın əmisi, Qori Müəllimlər Seminariyasının məzunu, görkəmli maarifçi, 1937-ci ilin qanlı sovet repressiyasının günahsız qurbanı olmuş Museyib İlyasovun tikdirdiyi Qorçu məktəbini ermənilər yandırmışdı, külü qalmışdı. Adamlar yanmış məktəbə baxıb göz yaşı axıdırdılar.

Növbəti gün Oğuldərəyə getdik, üç aylıq ayrılığa, doğma ev, torpaq həsrətinə son qoyuldu. Bir neçə gün kənddə qaldıq, evimizdə özümüzə yer hazırladıq, orada gecələdik, rahat nəfəs aldıq, ruhumuz dincəldi. Kənd yüz illərlə insan ayağı dəyməyən xarabalığı xatırladırdı. Yanmış evlər, sahibsiz itlər, biçilməmiş biçənəklər... Amma təbiət göz oxşayırdı, hər tərəf yaşıllıq idi. Adam doğma yurdundan, evindən ayrılıb soyuq, yağışlı Murovdakı çadıra qayıtmaq istəmirdi. Amma buna məcbur idik. Müvəqqəti evimiz, ailə Murovda idi.

***

1992-ci ilin sentyabr ayının sonunadək Murovdağın ətəyində alaçıqda yaşadıq. Murovun ətəyində məskunlaşan insanlar arasında köçmək məsələsində böyük mübahisə yaranmışdı. Bir qrup Oğuldərəyə, digəri isə Azərbaycanın başqa rayonlarına köçməyi təklif edirdi. Hara köçmək məsələsində mübahisələr həftələrlə davam edirdi. Doğma yurdundan didərgin düşən, taleyinə köçkünlük yazılan bu insanlar üçün bir-birindən ayrılmaq çətin idi. Ona görə də eyni yerdə məskunlaşmaq üçün hamını qane edəcək variant axtarılır, ortaq məxrəcə gəlinməyə çalışılırdı.

Murovda isə havalar getdikcə soyuyurdu. Bir dəfə qar yağdı, çox əziyyət çəkdik, qorxu keçirdik. Güclü qar insanlara və mal-qoyuna ciddi ziyan vurardı. Amma qar tez kəsdi.

Köçməyə maşın axtarırdıq. Atamgil bir neçə dəfə Xanlar (indiki Göygöl) rayonuna getmiş, maşın tapmayıb əliboş qayıtmışdılar. Atam yenə də Xanlara maşın dalınca getmişdi. Atam gecə qayıtmadı. Həmin axşam oğuldərəli Həsən Salahov gəldi, onun maşını ilə kəndə qayıtdıq. Bizdən sonra Şəki və Qaxda qaçqın kimi məskunlaşmış bir neçə ailə də kəndə qayıtdı. Ailəsi ilə birlikdə köçüb Oğuldərəyə qayıdanlar bunlar idi: **Əliyev Əli, Zülfüqarov Arif, İbrahimov Dadaş, İbrahimov Mötəbər, İbrahimov Təvəkkül, İlyasov Əşrəf, İbrahimov Xasay, İbrahimov Temir və Salahov Tofiq.**

Lacın Rayon İcra Hakimiyyətinin başçısı Azər Məmmədov, Ali Sovetin deputatı Səlim Səlimov, məsul şəxs Qəzənfər Hüseynov, hərbi komendant

Hüseynalı Həsənov Oğuldərəyə gəldilər, ev-eşiyinə qayıdanlara baş çəkdilər, gözaydınlığı verdilər.

Ermənilər Oğuldərəni işğal edəndə onlarla evlə yanaşı, kənd məktəbini də yandırmışdılar. Atam məktəb təşkil etdi. Dərsə gedirdik, müəllimlərin hamısı kənddə yox idi. Amma dərslərimiz boş keçmirdi, kəndə qayıdan müəllimlər onları əvəz edirdi.

Oğuldərədə sakit həyat yaşayırdıq. Qonşu Qorçu kəndində Şuşa və Laçının polis şöbələri, Ərikli kəndində isə Laçın Rayon İcra Hakimiyyəti yerləşirdi. Oğuldərədə yaşadığımız dövrdə döyüşən əsgərlərə əlimizdən gələn qayğını göstərməyə çalışırdıq. Elə bir gün olmurdu ki, onların vəziyyətindən xəbər tutmayaq.

***

1993-cü ilin fevralında radio məlumat verdi ki, Kəlbəcər-Ağdərə yolunu ermənilər bağlayıb. Bu yol əvvəlki illərdə də ermənilərin nəzarətində olmuşdu. 1992-ci ilin yayında Azərbaycan ordusu hücum etmiş, yolu və onun ətrafında olan kəndləri ermənilərdən azad etmişdi.

1993-cü il martın 31-i. Soyuq və küləkli bir gün idi. Görünür, təkcə təbiətlə bağlı deyildi, həm də yaxınlaşan düşmən təhlükəsinin gətirdiyi soyuq idi. Oğuldərədən bir neçə kilometr aralıdakı cəbhə bölgəsindən həyəcanlı xəbərlər gəlirdi. İşğal zamanı elektrik və telefon xətləri də sıradan çıxarılmışdı. Azərbaycan ordusu Laçının bir neçə kəndini, o cümlədən Oğuldərəni erməni işğalından azad etsə də, Laçının mərkəzi düşmənin nəzarətində olduğundan kommunikasiya xətlərini bərpa etmək mümkün olmamışdı. Ona görə də Azərbaycanda, cəbhə xəttində baş verən hadisələr haqda xəbərləri öyrənmək çox çətin idi. Məlumatları yalnız el arasında “əl radioları” adlandırılan kiçik radioqəbuledicilərdən almaq mümkün olurdu.

Radio xəbər verirdi ki, Ermənistan silahlı birləşmələri Kəlbəcərə hücumları intensivləşdirib, rayon bir neçə istiqamətdən düşmən həmləsinə məruz qalırdı. Cəbhə bölgəsindən aldığımız xəbərlər də narahatlığımızı artırırdı. Çünki Kəlbəcərin işğalı bizim erməni mühasirəsinə düşməyimiz demək idi. Düşmənin caynağından qurtulmaq üçün uzaq yol qət edib Kəlbəcərdən keçməliydik. Ermənilər Kəlbəcəri işğal edənədək oradan çıxa bilməsək, bizi ölüm və ya əsir düşmək təhlükəsi gözləyirdi.

Laçından Kəlbəcərə gedən yolun kənarında yerləşən Qorçu kəndinin sakinləri deyirdilər ki, bir neçə gündür Laçın cəbhəsində yerləşən Azərbaycan qoşun birləşmələrini və hərbi texnikanı yerləşdikləri mövqelərdən çıxarıb gecəylə Kəlbəcər istiqamətinə aparırlar. Qorxu içində yaşayırdıq. Valideynlərimiz ordunun Laçından çıxarılmasının səbəbini öyrənməyə çalışırdı.

Lakin bunun bir nəticəsi olmadı. Laçın cəbhəsində yerləşdirilmiş ordu hissələrinə rəhbərlik edən şəxslərdən yalan cavablar vermişdilər. Demişdilər ki, Laçın cəbhəsindən qoşunların çıxarılması ermənilərin Kəlbəcərə hücumu ilə bağlıdır, yuxarıdan Kəlbəcərə kömək göndərilməsi haqda göstəriş verilib. Ermənilər Kəlbəcərə hücum edib, cəbhənin həmin istiqamətində kömək lazımdır, bir neçə gündən sonra ordu geri - Laçındakı mövqelərə qayıdacaq.

Mart ayının 30-da axşamtərəfi məlumat aldıq ki, Qorçu sakinləri artıq kəndi tərk etməyə başlayıblar. Bu xəbəri eşidəndə hamı kəndin ortasına toplandı. Qadınlar dizlərinə, sinələrinə döyüb ağlayırdılar, nalələri ərşə dirənmişdi. Kişilər onları sakitləşdirməyə çalışırdılar, ancaq özləri də gərgin vəziyyətdə idilər, dayanmadan siqaret çəkirdilər. Xeyli danışdılar, belə qərara gəldilər ki, sabaha qədər gözləmək lazımdır. Sabah isə yenidən Laçın cəbhəsinin qərargahı yerləşən Ərikli kəndinə gedib vəziyyəti öyrənməyi planlaşdırdılar.

Gecəni narahat yatdıq. Yatmamışdan əvvəl atam bizə bir neçə tapşırıq verdi: “Heç kim paltarlarını soyunmasın. Əgər ermənilər gecə kəndə hücum etsələr, evdən çıxmayın. Evin künclərində, pəncərənin alt hissəsində gizlənin. Qorxmayın, atanız yanınızdadır, arxayın yatın”.

Atam tapşırdığı kimi etdik. Özü də paltarlarını soyunmadı. Avtomat silahını ehtiyat gülləələri ilə birlikdə yastığının altına qoydu. Narahat yatdığımız həmin gecə Oğuldərədə doğma və isti evimizdə qaldığımız sonuncu gecə oldu.

Martın 31-də səhər sübhdən yuxudan oyandıq. Həmişə olduğu kimi mal-qoyuna ot verdik, anam inəkləri sağdı və evə qayıtdıq. Kənddə sakitlik idi. Səhər yeməyi üçün süfrə arxasında oturduq. Atam dedi ki, tələsir, Əikliyə gedəcək. Anam samovardan çay süzürdü. Ancaq heç kim bir tikə də çörək yeməmişdi. Oturduğumuz otağın pəncərəsindən kəndə daxil olan yol görünürdü. Kəndimizə iki nəfər hərbi geyimli şəxs gəldi. Atam söylədi ki, Laçın polisinin əməkdaşları idi. Biri qorçulu Cəfərin oğlu Zöhrabdır. Atam həyətə çıxdı, biz də onun ardınca. Atama dedilər ki, vəziyyət çox ağırdır: “Laçın cəbhəsindəki bütün qüvvələr mövqelərini tərk eləyib. Ermənilərlə üzbəüz olan postlarda heç kim qalmayıb. Erməni hərbi birləşmələr heç bir maneəyə rast gəlmədən bura yaxınlaşırlar. Təkcə siz qalmısınız. Təcili kəndi tərk eləyin”. Hərbçilər bunu deyib getdilər.

Onlardan fərqli olaraq bizim kəndimizi, doğma evimizi, ata-baba yurdumuzu tərk etməyimiz asan iş deyildi. Digər tərəfdən isə piyada getməsi mümkün olmayan qocaları, qadınları, uşaqları aparmaq üçün maşın yox idi.

Kənddə yalnız bir nəfərdə - Abdulrəhimov Kamalın oğlu Məcidin "QAZ-52" markalı sınıq-salxaq bir avtomobil vardı. Həmin "QAZ-52"-nin texniki imkanları qarlı-palçıqlı dağ yolları ilə hərəkət etməyə imkan vermirdi. Kəndin ortasında dəhşətli vəziyyət yaranmışdı. İnsanlar ağlaşır, nə edəcəklərini bilmirdilər. Heç kim də qocaları, arvad-uşağı düşmən caynağına vermək fikrində deyildi, onları nəyin bahasına olursa-olsun xilas etmək lazım idi. Düşmən qarşısında əlacsız və köməksiz qalan adamların bir fikri vardı: nəyin bahasına olur-olsun hamımız bir yerdə hərəkət etməliyik. İstər kənddən çıxmaq olsun, istər qalmaq.

Arif Zülfüqarovun vəziyyəti daha ağır idi. Anası Pəri xala bir neçə il əvvəl iflic olmuşdu, ağır yataq xəstəsi idi. Arif söylədi ki, anasını aparmaq imkanı olmasa, heç bir yerə getmək, Oğuldərəni tərk etmək niyyətində deyil, ailəsi, uşaqları ilə birlikdə kənddə qalacaq.

Erməni silahlı birləşmələri artıq bizdən bir qədər aralıda olan kəndləri də tutmuşdular, evləri yandırırdılır, tüstü göyə qalxırdı. Düşmən heç bir maneəsiz bizim olduğumuz əraziyə yaxınlaşsa da, Arif dediyindən dönmürdü. Qohum-qardaşı belə bir vəziyyətdə tək qoyub getmək yolverilməz olduğuna görə heç kim bununla razılaşmırdı.

Belə bir ağır vəziyyətdə Kamal oğlunu göndərdi ki, qocaları və uşaqların hamısı hazırlansın, maşın gəlir onları götürməyə. Bir qədər sonra maşın gəldi və yeriyə bilməyən yaşlıları, uşaqları maşına yığdıq. Maşın evlərdən bir qədər aralıda dayanmışdı. Arif Zülfüqarov neçə illərdir yataq xəstəsi olan anası Pəri xalanı kürəyində maşına gətirdi, yerini rahatladı (Pəri xala Murovdağda donaraq dünyasını dəyişdi).

Qocaları, on yaşdan kiçik uşaqları maşına yığdılar. Maşın yerindən tərpənəndə uşaqlı - böyüklü hamı ağlayırdı. Ağlaşma səsi dağları lərzəyə salmışdı. Bu, bir ildə ikinci dəfə doğma evindən, torpağından didərgin salınan insanların ürək göynədən fəryadı idi. Həmin mənzərə onun şahidi olanların yaddaşından heç vaxt silinməyəcək.

İnsanla dolu "QAZ-52" palçığı yara-yara, sürüşü-sürüşə yola düşdü. Palçığa bata-bata gözdən itdi. Evə tərəf qayıtdıq. Hər kəs öz evindən gücü çatanla – təzə paltar, adyal, ayaqqabı ilə şəllənmişdi. Bundan başqa yalnız çörək götürülürdü. Az şey götürmək lazım gəlirdi ki, at yolda yorulmasın, tez yerimək mümkün olsun. Piyada gedən qadınlar, uşaqlar ağlaya-ağlaya yola düşdülər.

**YADDAŞ**

## ANAMIN KÖNÜL YANĞILARI



İnsan dünyaya gəlir, göz açır bu həyatda, uşaqlığı təkrarolunmaz təntənədi, yeniyetməliyi əlçatmaz yenilməzlikdir, gəncliyi qələbədir, qüdrətdir, qüvvətdir, qeyrətdir, qocalığı ağsaqqallıq, ağbirçəklikdir, müqəddəsdir, uludur, çox təəssüf ki, bu da bir insan ömrünün sonudur.

Deyirəm, könül dünyamı köklənmişəm, ürəyimi min bir dərdi-sərlə yükləmişəm. Söz deyib-söz qoşmaq, qəriblik, məcburi köçkünlük həyatından danışmaq istəyirəm, qəribliyə, ağrı-acıya bayatı düzüb-qoşan, söz söyləyən ağ saçlı, mələk sima, qəlbi nurlu, özü qürurlu, gözəl-göyçək anamın sözlərini bir insan ömrü qədər uzatmaq, yaşatmaq istəyi ilə dolaşıram. Kədərimi, sevincimi sizlərlə bölüşmək istəyirəm. Söyləmək istədiyim hər bir söz müqəddəsdir, köçkünlük qığılcımı ilə alışan odlu nəfəsdir, min bir haraylı qərib bir fəryaddır, səsdir, özcə dərdim özümə bəsdir; amma neyləyim, nə deyim, bu da məndə bir həvəsdir.

Mənim anlamımda bu qocaman dünyada hər bir varlıq olduğundan da gözəldir; gecə də gözəldir, gündüz də, tikan da gözəldir, gül də, səssizlik də gözəldir, şənlik də, qocalıq da gözəldir, gənclik də... Ana dediyimsə bu rəngarəngliklərin, bu gözəlliklərin alisidir, ana dediyim elə bir varlıq, elə bir məxluqdur ki, öyüdüm, məsləhətim, nəsihətimdir, ucalıqda əlçatmaz zirvə, cismən başdan ayağa sevincimdir.

Nə yazıramsa, bunların hamısı anamın könül yanğılarıdır. Mən onun ürəyində zamanın, mühitin, düşmənlərin, bəlkə də cəmiyyətin boğub öldürmək istədikləri ülvi gözəllikləri üzə çıxarmaq və yaşatmaq istəmişəm. İmkansızlıq ucbatından özünün ad verə bilmədiyi ülviliklərə ad verməyə çalışmışam. Öz könül yanğılarını bayatıların dili ilə canlandırmağa çalışan anamın söylədiyi sevgili, nəğməli, eşqli, ehtizazlı, dərdli-qəmli, sevincli-kədərli xalq bayatıları onun dilindən sinədəftər söylənildiyindən mənim üçün çox-çox əzizdir.

Səmərqa Hümbətova 1929-cu il iyul ayının 1-də kəndli ailəsində, Laçın rayonunun olduqca dilbər, ecazkar bir guşəsində, Kürdhacı kəndində anadan olmuşdur.

Anam 1937-ci ildə Kürdhacı kənd ümumtəhsil tam orta məktəbinin birinci sinfinə gedir. Təhsilini latın (Yanalif) qrafikalı əlifba ilə başlayır. Lakin iki il sonra, 1939-cu ildə Stalin türklərə qarşı aparılan pantürkizm

ideyalarının davamı kimi Kiril əlifbasının Sovet İttifaqının bütün müsəlman ölkələrinə tətbiq etdilməsinə dair qərar verdiyindən təhsil sistemində "islahatlar" aparılaraq Kiril əlifbasına keçid verilir. Digər uşaqlar kimi Səmərqanın da təhsil almasında müəyyən çətinliklər yaranır.

22 iyun 1941-ci ildə Almaniya SSRİ-yə qarşı elan edilməmiş müharibəyə başladı. Atası müharibəyə yollandığı üçün ailədə maddi vəziyyət çətinləşdi. 5 qız və atasının üzünü görmədiyi 1 oğul övladı anası Mahizərin öhdəsində qaldı. Ailədə uşaqların böyüyü olan Səmərqa müharibənin ağırlığını öz çiyinlərində hiss edirdi. Müharibə qurtarar-qurtarmaz kolxozda böyüklərlə çiyin-çiyinə əkin-biçin işlərində (yaşı az olduğundan əvvəlcə anasının, sonralar isə öz adından) çalışardı. Kolxoz işindən geri dönən Səmərqa şəxsi təsərrüfatda çalışan anasına kömək edər, baş-ayağa gedər, eləcə də digər işlərdə çalışardı. Qavrama qabiliyyəti yüksək olduğundan iş-güc zamanı, həmçinin xeyir-şərdə yanında söylənən hər sətir bayatı onun yaddaşına həkk olurdu.

Cəbhədən ara-sıra gələn "qara xəbər"lər kənddə qonşuların, qohum-əqrabanın qapısını tıqqıldadırdı. Günlərin bir günü müharibənin "qara xəbər"i onların da qapısını döydü. Cəbhədən atasının "qara kağız"ı gəlmişdi. Ön cəbhədə ağır yaralanan Ağakişiyev Bulud Atakişi oğlu Mahaçqalada hərbi hospitala yerləşdirilmiş və bir müddət sonra aldığı ağır yaralardan həlak olmuş, orada da dəfn edilmişdir. Atasından gələn "qara kağız"ı alan ailənin maddi vəziyyəti ilə yanaşı onsuz da yaxşı olmayan mənəvi durumu bir az da pisləşdi. Qəlb yanğısı artan anamın bayatı öyrənmək ehtiyacı daha da artdı. Qəmli-qüssəli bayatılara üstünlük verməyə başladı.

Bu gün də ev-eşikdə alman faşizmindən söhbət düşəndə anam faşistləri özünün ən qatı düşməni hesab edər və bayatıların dili ilə dərdini anlatmağa çalışar:

*Dağlarda bir ov qaldı,*
*Qar getdi, qırov qaldı.*
*Müharibə qurtardı,*
*Atamız girov qaldı.*

*Dərya boy verim ola,*
*Boylar boy verim ola.*
*Çıxıb çağıram, görəm,*
*Atam hay verim ola.*

1948-ci ildə ailə həyatı qurdu, 3 övlad böyüdüb boya-başa çatdırdı, tərbiyə etdi. Azərbaycan Taxta Emalı Sənayesi Laçın Meşə Təsərrüfatı İdarəsinin nəzdindəki Hacısamlı Taxta Emalı Zavodunda 18 avqust 1949-cu ildən 1 avqust 1965-ci ilə kimi fəhlə kimi çalışdı. 2 avqust 1965-ci ildən 10 dekabr 1989-cu ilə qədər Laçın rayon Kürdhacı kənd xəstəxanasında kiçik tibb

bacısı vəzifəsində işlədi. Çalışdığı hər bir müəssisədə çalışqanlığı və mehribanlığı ilə digər işçilərdən fərqlənirdi. Özünə gözəl yurd-yuva qurdu.

Övladlarının böyüyü, öz sözləri ilə desək, "gözünün ilk ovu" olan Nazilə ailə qurduqdan bir müddət sonra müəyyən səbəb üzündən Şuşaya köç etməli oldu.

*Araqçının başa düz,*
*Başdan götür başa düz.*
*Sən Şuşaya köçəndən*
*Əqlim gəlmir başa düz.*

*Qolumda yaram vardır,*
*Başımda bəlam vardır.*
*Qürbət adı çəkməyin,*
*Qürbətdə balam vardır.*

- söyləyən anam qızının qərib ellərə düşməsindən tez-tez gileylənərdi.

Müxtəlif iş-güclə məşğul olan anam hər zaman həzin səslə bayatıları zümzümə edər, ətraf mühitdən uzaqlaşar, öz daxili aləminə qapılar, qəlbinin dərinliklərindən süzülüb gələn bayatıları ifa edərdi. Çox vaxt öz fikrini yerli-yerində izah etmək üçün bayatılardan geninə-boluna söyləməyi xoşlayardı. Sanki buna adət etmişdi. Ya sevincdən, ya da qəm-kədərdən qəhərlənən zaman bayatı söyləyərək könül yükünü yüngülləşdirər. Əvvəllər bunun səbəbini çox hiss etməsəm də, tələbəlik illərində artıq bunları açıqca duymaqda idim və hər tətilə gələndə ondan eşitdiyim bayatıları qeydlər aparmaqla toplamağa başladım. Anamın söylədiyi və sayı 300-ü keçən bu bayatıları topladıqca onlar mənim üçün daha da maraqlı və əziz göründü.

Ümumiyyətlə, anamın qəlbinin dərinliklərindən gələn bu bayatılar mənim üçün ona görə əzizdir ki, bu misraları anamın öz dilindən eşitmişəm. Anam onları kitablardan, radio və televiziyadan deyil, yaşlıların söyləməsindən öyrənib. Və ən sonda ona görə əzizdir ki, bu misralar onun öz dərdi-səri, öz qəlbinin söz-söhbəti, könlünün yanğısı, ah-naləsi, öz sevinci, öz kədəridir.

Bayatıların dili ilə haray salan anamın heç ağlına belə gəlməzdi ki, özünün uzun illər yaşadığı vətəni, torpağı, obası, çalışıb-vuruşub, tikib-qurduğu yurdu, evi girov qalacaq, birdən-birə ömrünün ağbirçək çağında özü qəriblikdə ömür-gün keçirəcək. Qəlb yanğısı ilə söylədiyi yurd həsrətli bayatılar onun özünə aid olacaq və yaşın üstələdiyini hiss edən anam "bəlkə torpaqlar alındı, siz qayıtdınız, amma, o günləri görmək biz yaşlı nəslə qismət olmadı, İlahi siz cavanlara dəyməsin" söyləyər.

Laçın camaatının taleyinə qara hərflərlə yazılan həmin anların tükürpədici əksi mənim gözlərim önündə tez-tez canlanır. 1992-ci ilin may ayının 17-si idi. Demək olar ki, təlaş içində olan kənd əhalisinin yarıdan çox hissəsi (uşaqlar, qocalar, gəlin və qızlar) naəlaclıqdan artıq kəndi tərk etməkdə

idi. Bir-birinin ardınca bəd xəbərlər gəlir, erməni silahlılarının Laçını atəşə tutması, şəhər əhalisinin itki verməsi söylənilirdi. Ordunun pərakəndə şəkildə döyüşməsi və mövqeləri tərk etmələri xəbəri isə Kürdhacı və ətraf kəndlərdə yaşayan əhalini vahiməyə salmışdı.

Son dəfə quru, cansız divarları ayrılıq həyəcanı ilə qucaqladı, sığal çəkib öpdü. Doğma ev-ocağı ilə özünün bilib-başa düşdüyü bir türlə halallaşdı. Gileyli-gileyli, qəmgin səslə bayatıları harayladı:

*Muxur qurdum dəyirmi,*
*Muxun çaldım iyirmi.*
*Hara qoyub gedirsiz,*
*Bu ev sizin deyilmi?*

*Mən aşıq Ərzuruma,*
*Düşübdür ər zuluma.*
*Vətəndən olma, aşıq,*
*Düşərsən hər zuluma.*

Üzünü qibləyə tutub, əllərini göyə açıb Tanrıdan bu yurdu, bu el-obanı yaman günlərdən qorumağı rica etdi. Sonuncu kərə ətrafa doyunca baxdı, dərindən bir ah çəkdi və yük maşınının kabinəsinə əyləşdi. Saat 5 radələri idi, yük maşını kənddən rayona doğru istiqamət aldı. Anamı Kürdhacıdan, Laçından uzaqlaşdıran hər bir addım onu başqa bir həyata, sanki onun anlamayacağı bir məkana aparırdı.

Beləliklə, may ayının sonuna qədər Laçın rayonunun ərazisi boşaldıldı, Azərbaycanın didərginlər ordusunun sayı artdı. Bununla da zahiri kimi batili də gözəl olan anam ahıl yaşında didərginlik həyatını yaşamağa başladı. Mən iyun ayının 2-də valideynlərimlə Bərdə rayonunun Soğanverdilər kəndində görüşdüm. Əlindən hər iş gələn, diribaş, zirək, dilli-dilavər, hər kəsə şən və mehriban olan anam dəyişmiş, onun məhzun baxışlarını, lal olmuş dilini, vətən xiffəti hopmuş qəlbini görüncə xeyli çaşdım. Sanki bu bir neçə gündə ömrünün üstünə bir ömür gəlmiş, tamamən əldən düşmüş, qocalmışdı. Bu halının səbəbini sordum, qısaca bir cavab — "Təndirxanamız boyda üstüörtülü bir yerimiz olsaydı, bala ..." — söylədi və qəhərləndi. İkimərtəbəli evi, geniş, bəzəkli otaqları, hektarlarla bağ-bostanı olmuş ailəmiz üçün anam xırda, kiçicik bir təndirxana boyda yer sorağında idi. Ümidsizlik qadını əldən salmışdı, həmkəndliləri və qohum-əqrabası ilə görüşəndə isə yeganə təsəllisi könül yanğısı ilə söylədiyi bayatılar idi.

Məsləhətləşmələrdən sonra razılaşdıq ki, Bakıda məskunlaşaq. 1992-ci il iyun ayının ikinci ongünlüyündə ailəmiz müvəqqəti olaraq məcburi köçkün (dilim də gəlmir söyləməyə!) kimi Bakıda, Binəqədi rayonunun Biləcəri qəsəbəsində məskunlaşdı. Bununla da ailəmizin həyatında çətin bir dövr — məcburi köçkünlük həyatı başlandı. Ötən hər gün anamı doğma yer-yurddan uzaqlaşdırsa da, ömrünün son baharında belə el-obaya qayıdacağı günü

səbirsizliklə gözləyir. Bu minvalla artıq 21 il arxada qalıb. Bu illər ərzində çox şey dəyişdi, dəyişməyən bir şey vardır ki, o da anamın hər zaman könül yanğısı ilə söylədiyi bayatılar...

*Aşıq ellər ayrısı,*
*Şana tellər ayrısı.*
*Bir günə dözməz canım,*
*Oldum illər ayrısı.*

*Aşiqin odu yarı,*
*Bayquşun odu yarı.*
*Qürbətdə vətən tutdum,*
*Unutdum o diyarı?!.*

Laçın verildi və unuduldumu? Verildi və hər şey bitdi, qurtardı, yaddan çıxdımı? Bu heç də belə deyil. Bu ağır yükü çiyinlərində illərlə daşıyan, bu dərdi qəlbində yaşadan, sağalmaz yaranın ağrı-acısına dayanan, dözən Səmərqa Hümbətova kimi qocalı-cavanlı minlərlə insan var.



Ulu babalarımızdan bizlərə və gələcək nəslə yadigar qalan, milli ruhumuzu və yaddaşımızı bütün zənginliyi ilə özündə qoruyub saxlayan aranlı, yaylaqlı qədim torpaqlarımız düşmən tapdağında, işğal altındadır. Torpaqların işğalı ilə bağlı bütün baş verənlərdə bugünkü gənc nəslin — bizim də günahımız kifayət qədərdir. Görəsən ulu Tanrı günahımızdan keçəcəkmi?... Məncə Tanrı günahımızdan keçər, amma gələcək nəsillər bu günahlarımızı bizlərə bağışlamayacaq!...

**Sultan HÜMBƏTOV**

**DÜNYA ƏDƏBİYYATI**

**Robin ZİGER**

## ZƏFƏR ÜÇÜN DOĞULANLAR
**(davamı)**

### ƏN BÖYÜK SİZSİNİZ

Uşaqkən bizə hər bir qar dənəsinin taysız olduğu, başqa bir qar dənəciyinə bənzəmədiyi söylənilirdi. Barmaq izlərimiz, səslərimiz, genlərimiz barədə də eyni şeyi deyərdilər. Buna görə hər birimizin tayı-bərabəri olmayan bir fərd olduğuna əmin ola bilərdik. Bununla belə, dünya tarixində bizə bənzər birisinin var olmadığını bilməyimizə rəğmən yenə də adət üzrə daim özümüzü başqaları ilə müqayisə edirik.

Bir fərd olaraq hamımız misilsizik, fəqət bizi növ olaraq misilsiz edən şey, fikrimcə, şüurlu düşüncənin tətbiqi yolu ilə özümüzdə dəyişiklik yarat-

ma qabiliyyətimizdir. Günümüzdə elm adamları şəxsiyyət və qabiliyyətlərin yüzdə əllisinin genlər yolu ilə irsən keçdiyinə inanırlar. Yerdə qalan yüzdə 50-ni yaratmaq və inkişaf etdirmək özümüzə bağlıdır. Doğuşdan sahib olduğumuz və heç bir pozitiv düşüncənin dəyişdirə bilməyəcəyi – boyumuz, göz və dəri rəngimiz kimi şeylər olduğunu qəbul etmək zorundayıq, əlbəttə. Fəqət onlarla bağlı düşüncə tərzimizi dəyişdirə bilərik və bu, misilsiz bir qabiliyyətdir. Tez-tez "Mən heç də özəl, fərqli biri deyiləm" deyən insanlarla rastlaşıram. Gerçək budur ki, hər kəs özəldir, fəqət buna özünüz inanmasanız, başqa heç bir kimsə də inanmayacaqdır.

Bir uşağı düşünün. Çoxlu öyüd (təriflər) və şərtsiz sevgi alır, ona nə qədər özəl olduğu söylənilir – inkişafda olan zehnə verilən gücləndirici mesajlar. Fəqət böyüdükcə bu proses yavaşıyır. Burada özəlliklə önəmli olan faktor itaət etməyi, uyğunlaşmağı, fərqli olmamağı öyrənməyimizdir.

Bir anlamda siz də fərqli deyilsiniz. Lakin öz şəxsi markanızı yarada bilərsiniz. Kiçik detallar böyük fərqlər yaradır.

Özünüzü, gördüyünüz işlə, içində yaşadığınız evlə, mindiyiniz maşınla və ya geydiyiniz paltarlarla tanımlamayın. Siz bu şeylərin cəmi deyilsiniz. Başarılı insanların inandıqları şey öz içlərindədir.

Bir keşiş ölüm döşəyində yatırdı. Arvadına ürəyindəki bu sözü dedi: "Gənc olarkən dünyanı dəyişdirməyə qərarlı idim, bu üzdən gedib hər kəsə necə yaşamalı və nə etməli olduqlarını anladardım. Fəqət bu, heç bir işə yaramırdı, çünki məni heç kəs dinləmirdi. Bu üzdən bunun yerinə ailəmi dəyişdirməyə qərar verdim, lakin dəhşət içində gördüm ki, onlar belə mənə məhəl qoymur, istədiyim dəyişiklikləri etmirlər. Ancaq indi, həyatımın son illərində üzərində gerçək bir təsir buraxa biləcəyim tək insanın elə özüm olduğumu anlaya bildim. Dünyanı dəyişdirmək istəyirsənsə, buna özündən başlamalısan".

Hədəfinizə təbii qabiliyyətlərinizdən istifadə etməklə nail ola bilərsiniz. Bununçün şəxsi məsuliyyətinizi qəbul etməlisiniz. Fərd olmaq təkbaşına olmaq demək deyildir. Bu, kim və nə olacağınızı özünüzün seçməsi ilə bağlı bir şeydir.

***İnsanlar o ankı durumları üçün daim şərtləri suçlayarlar. Mən şərtlərə inanmıram. Bu dünyada işləri yaxşı gedənlər – yerlərindən qalxıb istədikləri şərtləri arayanlardır, bulmadıqları təqdirdə onları özləri yaradırlar.***

**Corc Bernard Şou (1856-1950)**

Başarı, uğur insanın bir fürsəti yaxalayıb onu uğura dönüşdürmək üçün çox çalışması ilə başlayır. Fəqət, ilk addım fürsəti olduğu kimi görüb qəbul etməkdir.

Bir vadidə yaşayan yaşlı bir rahib (keşiş) varmış. Qırx il boyunca öz bölgəsində yaşayan insanların qayğısına qalarmış. Onları xaç suyuna salar, cə-

nazələrini götürər, gənc cütlükləri evləndirər, xəstə və kimsəsizlərə təsəlli verərmiş. Bütün bu müddət ərzində o, yaxşı və mübarək bir insan örnəyi olubmuş. Günlərin bir günü yağış yağmağa başlamış, elə yağmış ki, iyirmi günlük şıdırğı leysandan sonra su o qədər qalxmış ki, yaşlı rahib kilsənin çatısına çıxmaq zorunda qalmışdır. Orada titrəyə-titrəyə oturarkən qayıqla bir adam yanaşmış və "Xocam, tez qayığa minin, sizi quruya çıxarım" demişdir.

Rahib bu adama baxıb və "Qırx ildir Tanrının məndən gözlədiyi hər şeyi artıqlaması ilə etmişəm" demişdir. "Xaç suyuna saldım, cənazə götürdüm, xəstə və kimsəsizlərə həyan oldum, ildə yalnız bir həftəliyə tətilə çıxdım. O bir həftəlik tətildə nə etdiyimi bilirsinizmi? Bir yetimxanaya gedib aşbaza kömək edirdim. Tanrıya xidmət etdiyim üçün ona inancım böyükdür. Ona görə sən öz qayığınla get, mən qalacağam. Tanrım məni qoruyar".

Qayıqdakı adam oradan ayrılmış. Daha iki gün keçmiş və yağmur suları elə bir səviyyəyə qalxmışdır ki, ətrafındakı sellər burulğana dönərkən qoca rahib kilsənin zəng qülləsinin ucundan asılı vəziyyətdə qalıb. Bu dəmdə bir helikopter gəlmiş və pilot ona səslənmiş: "Xocam, tez olun, aşağıya bir trap göndəririk. Kəməri belinizə taxın, sizi qurtaracağıq". Yaşlı rahib buna "xeyr, xeyr" deyə cavab vermiş, yenə də əməllərindən, Tanrıya inamından bəhs etmişdir. Beləcə helikopter də getmişdir. Bir neçə saat keçmədən rahib sulara qərq olub boğulmuşdur.

Yaxşı bir adam olduğundan birbaşa cənnətə düşmüşdür. Qədərinə qeyzlənərək çox pis bir əhvalda oraya varmışdır. Cənnətdə qızğın bir şəkildə islaq ayaqları ilə yürüyərkən birdən Tanrı ilə rastlaşmışdır. Tanrı heyrətlər içində ona baxıb "Rahib Makdonald! Nə xoş bir görüş!" demişdir. Buna cavab olaraq rahib ona dik-dik baxıb "Xoş görüşə bir bax!" demişdir. "Qırx il boyunca məndən istədiyin hər şeyi artıqlaması ilə etdim. Amma sənə ən çox ehtiyac duyduğum bir zamanda məni boğulmaya tərk etdin.

Bu dəfə Tanrı ona təəccüblə nəzər salmışdır: "Boğuldunmu? Buna inanmıram. Əminəm ki, sənə bir qayıq və bir helikopter göndərmişdim".

Həqiqətən də, qayıq və helikopter fürsətləri hər birimizin həyatında olan fürsətlərdir. Bizə düşənsə onları görə bilməkdir. Təsadüfi görünən hər bir olay fürsət yaradır. Şübhəsiz, şəxsi faciələr istisna təşkil edir.

Həyat şərtləriniz necə olurlarsa-olsunlar, başlanğıc nöqtəniz gedib çata biləcəyiniz yerin bir göstərgəsi deyildir. İngiltərəyə köç edən birisinin öz səyləri hesabına milyoner olma şansı burada doğulmuş birisinə görə dörd qat artıqdır. Buradakı önəmli nöqtə, uğurun şəxsin boya-başa çatma şərtləri ilə çox az əlaqəli olmasıdır.



Həyatda əldən verilmiş fürsətlər qədər peşmanlıq yaradan heç bir şey yoxdur. Bu üzdən fürsətləri yaxalamaq üçün gözləməyin, sabaha saxlamayın. Sonunda 85 yaşına gəlib çatanda, bu gün başlama şansınız olan bütün o şeyləri "kaş ki etmiş olaydım" deyə heyifsilənməyəsiniz.

***– Doğru şeyi etmənin yanlış zamanı yoxdur.***

***– Əndişə və qayğıları həyatınızın böyük fəlakətləri üçün saxlayın. Bu günsə hər durumda normal bir çəm, yanaşma tapmaq üçün şüurlu bir səy göstərin. (Müəllif)***

*Səlcuq türkcəsindən uyğunlaşdıranı:*
**Yusif OTAYLI**

**KİTAB RƏFİ**




## "BİTMƏYƏN ÖMÜR"

Xoşbəxtlik uzun ömür sürməkdə deyil, yaşadığın həyatı mənalı, vətənə, xalqa, tanıdığın və tanımadığın insanlara, onların rifah halının yaxşılaşmasına, rövnəqlənməsinə sərf etməkdədir. Elə insan tanıyıram ki, çox yaşasa da heç kimin xatirəsində qalmır, tezliklə unudulur, yaddan çıxır. Elə insanlar da var ki, gənc ikən dünyasını dəyişsə də, "şirin bir xatirəyə" dönərək ürəklərə köçür, ölməzliyə qovuşur, ömrü cild-cild kitablara sığmır. Belə insanlardan biri də qəlbi xeyirxahlıq hissi ilə dolu olan, ömrü xatirələrə sığmayan, ürəyi yaratmaq, qurmaq, ucalmaq, ucaltmaq eşqi ilə döyünən ziyalı, texniki elmlər namizədi, xeyriyyəçi Lətif Hacı Frunze oğlu Əsədov idi.




Amalı bəşəriyyətə sevgi, ürəyi yurd nisgilli Lətif Əsədov çox qısa bir ömür yaşadı: cəmi 52 il. Lakin bu qısa ömür kitabında möhtəşəm səhifələr yaratdı. Özünə çoxlu dostlar qazandı. Nüfuz sahibi oldu. Məhz bunun nəticəsidir ki, Lətif müəllimin həyat kredosunu özündə əks etdirən və 496 səhifədən ibarət olan bir kitab araya-ərsəyə gəldi. Kitabın tərtibçisi, "Qızıl qələm" mükafatı laureatı Araz Yaquboğlunun "Bitməyən

ömür” adlandırdığı və nəfis tərtibatla “Nurlar” Nəşriyyat-Poliqrafiya Mərkəzində nəşr olunan kitab şair-publisist, Prezident təqaüdçüsü Qılman İmanın səmimiyyətlə qələmə aldığı “Kitab ömürlü alim” başlıqlı “ön söz”lə açılır. O, haqlı olaraq yazır: “Sözün yaddaşına köçmək, yaddaşın “sözünə” çevrilmək hər bəşər övladına müyəssər olmur. Böyük hərflərlə qeyd olunacaq İNSANLIQ məfhumu sözlə yaddaşın arasındakı məsafədə bərqərar olanda əbədiyyətə – lahut aləminə qovuşur, ölümsüzlük simvoluna çevrilir”.

Kitabda 84 müəllifin xatirəsi, onun haqqında yazılmış şeirlər və Sərraf Şiruyənin “Göyçədən gələn səslər” adlı poeması öz qiymətini hələ sağlığında almış nəciblik mücəssəməsi Lətif Əsədovu oxuculara tanıtdırmaq baxımından çox dəyərli mənbələrdir. Sumqayıt Dövlət Universitetinin Azərbaycan dili və ədəbiyyatın tədrisi kafedrasının müdiri, dosent Yusif Aslanov, texniki elmlər doktoru, professor, respublikanın əməkdar ixtiraçısı, əməkdar kənd təsərrüfatı işçisi Ziyad Abbasov, əməkdar həkim, professor Qələndər Canbaxışov, hüquqşünas Fərid Məmmədli, ATU-nun I Uşaq xəstəlikləri kafedrasının assistenti Ələmdar Cəfərov, Balaxanı qəsəbə Cümə məscidinin axundu Hacı Ramin, xalq artisti Teymur Mustafayev, filologiya üzrə fəlsəfə doktoru Tacir Səmimi, psixologiya üzrə fəlsəfə doktoru, dosent İlham Mirzəyev, tibb elmləri doktoru Rafiq Rzayev, yazıçı Həşim Həsənoğlu, tibb elmləri namizədi Akif Kərimov, Laçın rayon 18 №-li tam orta məktəbin direktoru Ramiz Həsənov, Aşıq Ədalət Dəlidağlı, yazıçı Pənah Azəri, “Abituriyent” jurnalı redaksiyasının baş mütəxəssisi Məhərrəm Bədəlov, şairlərdən Eldar Həsənli, Alqayıt, Maqsud Ülvi, fəlsəfə doktoru Davud Dəmirli, mərhumun digər dostları, ailə üzvləri, tələbə və iş yoldaşlarının yazılarını oxuduqca Lətif Əsədovun nurlu çöhrəsi, daxili və zahiri aləmi, bir sözlə, bütün xarakterik əlamət və cəhətləri göz önündə canlanır.



Kitabın üstün cəhətləri Lətif müəllimin elmi məqalələrinə xüsusi yer ayrılması, buraya daxil edilmiş şəkillərin bizə bir ömrün fotoxronikasını xatırlatmasıdırsa, “Bitməyən ömür” kino-diski bu sənət əsərinin son nöqtəsidir.

Əvvəldə də qeyd etdiyimiz kimi böyük zəhmət bahasına araya-ərsəyə gəlmiş “Bitməyən ömür” kitabı Lətifsevərlər tərəfindən sevilə-sevilə qarşılanacaq və yüksək dəyərləndiriləcəkdir.

**Mütəllim HƏSƏNOV,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***“H.B.Zərdabi” mükafatı laureatı***

**ƏDƏBİ İRSİMİZ**

## “O DAĞLAR AZADDI” – DEDİ HÜSEYN KÜRDOĞLU...



Mərhum deməyə dilim gəlmədiyi Hüseyn Kürdoğlu adlı bir gözəl şairimiz həyatımın ağır keçən, son üç ayda az qala ölümlə uğraşdığım günlərin birində yuxuma gəldi. Üzü gülürdü, “Laçın dağlarından gəlmişəm, o dağlar azaddı” – bunu dedi və getdi. Bu yuxunu necə yozacağımı bilmirəm. Bircə onu deyə bilərəm ki, çox zaman yuxular çin olur və bu yuxuda Hüseyn Kürdoğlunun “dağlar azaddı” kimi xoş xəbərinin gerçək olacağına inanıram. Doxsanıncı illərdə yazılan şeirlərin böyük bir qismi işğal olunmuş dağlarımızın, kəndlərimizin həsrətiylə yazılıb. Bu şeirlərdə fəryad da var, çağırış da... Hüseyn Kürdoğlunun o illərdə yazdığı şeirləri oxumaq kifayətdir ki, doxsanıncı illərin Azərbaycan poeziyasında HƏSRƏT, ÇAĞIRIŞ ərazilərinə” daxil olaq. Doxsan üçüncü ildə, Laçın işğal olunandan sonra yazılan bir şeir:

*Qismət olmayaydım ayrı torpağa,*
*Gözlərim Laçını görəydi bir də.*
*Sürünüb çıxaydım İşıqlı dağa,*
*Əllərim bənövşə dərəydi bir də.*

*Beşbulaq üstündə quraydım dəyə,*
*Canım alan yara “can” deyə-deyə.*
*İldırım çaxanda baxaydı göyə,*
*Qaçaydı, qoynuma girəydi bir də.*

*Biçarə Kürdoğlu, ah çəkib inlə.*
*Bu qanlı dövranın hökmünü dinlə.*
*Qoşa at minəydim o nazəninlə,*
*Köhləni yanımca sürəydi bir də,*
*Gözlərim Laçını görəydi bir də.*

Hüseyn Kürdoğlunun Laçınlı duyğuları poeziyada özünəməxsus LAÇIN obrazını yaradır. Bu obrazı zaman etibarilə üç məqamdan izləmək olar: Laçının azad və xoşbəxt günləri... Şair Laçına anam deyir, dizinə baş qoyur. Deyirdi ki: *“Coşum Dəli dağın boranı kimi, Şeh səpim Qırxqızın dumanı kimi. Məcnun bulağının mərcanı kimi şeirimi yaxana düzüm, ay Laçın”.* İkincisi: Laçının işğalı... H.Kürdoğlunun “Yaralı torpağım, yaralı sevgim” kitabında Laçın Həsrət simvoluna çevrilir. Yara hələ təzədi, qaysaq bağlamayıb. Şair inanır ki, Azərbaycan oğulları Laçını işğaldan azad edə-

cəklər. Odur ki, üzünü laçınlılara tutub deyir: *“Alay tutun, vaxtdır daha, laçınlılar, Bir yol açın xoş sabaha, laçınlılar!”* Yaxud: *“Qoca Kürdoğlunu bir əsgər sayın, Çağırır Qarabağ, çağırır Laçın...”* Üçüncü məqam: Laçın artıq xatirəyə dönür. O, şairin yuxularına girir. Kəlbəcərli, Laçınlı, Həkərili günlər, o bölgədə olan meşələr, dağlar, dərələr, çaylar, göllər də tez-tez yada düşür... Bu tipli şeirlər Laçın obrazının ayrı-ayrı dolğun cizgilərini təşkil edir.

“Azərbaycan” şeirində dörd misra ilə fəlsəfi fikir söyləmək, həyat, ölüm, dünya və zaman haqqında poetik düşüncələr hasil etmək klassik ənənələrdən gəlir. Lakin onu da qeyd edim ki, şeirin bu kiçik formasında uğur qazanmaq hər şairə müyəssər olmur. O yerdə ki, şair başlayır “filosofluq” eləməyə, o zaman şeir dönüb olur “kəlam”, “hakimanə söz” yığını. Hüseyn Kürdoğlunun dördlükləri belə bir iddiadan uzaqdır. Şair çalışır ki, dörd misrada həcmcə böyük bir şeirdə deyə bilmədiyi fikri poetik ümumiləşdirmə ilə deyə bilsin, bir bənzərsiz lövhə yaratsın. Bir neçə misal göstərə bilərəm:

*Saçından rəng alsın gərək qaranlıq,*
*Gözündə bir gilə kövrək qaranlıq.*
*Dünyaya göstərir ay camalını*
*Əyninə geydiyin ipək qaranlıq.*

*Yıxsın qarşısından Araz barını,*
*Dərək Kür barıtək, Araz barını,*
*Araz körpüsündə qoy bir tar çalım,*
*Sahillər dinləsin Arazbarını.*

*Qoca İşıqlının saçı dümağdır,*
*Gecələr sinəsi çıraq-çıraqdır.*
*Bəlkə yun əyirir bu qarı nənə,*
*Təpələr yanında yumaq-yumaqdır?!*

*O qıza neylədin, a yağı bulaq,*
*Kəsilmiş üstündən ayağı, bulaq.*
*Bir zaman dirilik şərbətim oldun,*
*İndi ay zəhrimar, a yağı bulaq.*

*Sənsiz qor tökülür qoynuma gecə,*
*Alov geyinirəm əynimə gecə.*
*Özgə bir gözələ baxmışdım dünən,*
*Min şahmar sarıldı boynuma gecə.*

Misallardan göründüyü kimi bu dördlük nümunələri (əslində, rübai) şeirdə az sözlə maraqlı fikir söyləməyin mümkün olduğunu sübuta yetirir. Diqqət yetirsəniz, bu rübailərin heç birində yavan-yalxı sözlər gözə dəymir və bu sözlər dörd misrada obraz yaratmaq məramına xidmət edir. Hüseyn Kürdoğlu ədəbiyyata əllinci illərin əvvəllərində gəlib. İlk şeiri 1950-ci ildə “Azərbaycan gəncləri” qəzetində dərc olunub. ADU-nun (indiki BDU) filologiya fakültəsində oxuyanda respublika qəzetlərində şeirləri ilə müntəzəm çıxış edib və elə ilk şeirlərindən ustadların diqqətini cəlb edib. Məsələn, Bəxtiyar Vahabzadə gənclərə həsr etdiyi bir məqaləsində yazmışdı: “…Hüseyn Kürdoğlu da ümid verən gənclərdəndir. Onun şeirləri tə-

bii, səmimi və axıcıdır. Gənc şair qələmə aldığı mövzunu dərindən duyub, yaşamadan yazmır. Bu cəhətdən onun "Yol üstündə tək qovaq", "Görüş xatirəsi", "İnanmıram", "Torağayım" və s. şeirləri çox maraqlıdır".

Bəxtiyar müəllimin o zaman cavan Hüseyn Kürdoğlunun şeirlərində sezdiyi bu cəhətlər sonralar onun yaradıcılığının başlıca məziyyətlərinə çevrildi. Hüseyn Kürdoğlu həmin o təbiiliyə, səmimiliyə həmişə sadiq qaldı. Mən Hüseyn Kürdoğlunun əlli illik yaradıcılıq yolunu izlədim və tam yəqinliklə əmin oldum ki, onun müasir poeziyamızda özünəməxsus yeri var. Heç də o fikirdə deyiləm ki, onun poeziyasına sağlığında obyektiv qiymət verməyiblər və dünyasını dəyişəndən sonra buna daha çox ehtiyac var. Həm də qətiyyən düşünmürəm ki, sağlığında onun şeirlərinin bədii məziyyətləri, poetik özəllikləri barədə söz deməyiblər. Axı, Hüseyn Kürdoğlu doğrudan da bir kimsəyə bənzəmirdi. Əsasən xalq şeiri üslubunda qələm çalan və sözün həqiqi mənasında müasir qoşmanın, gəraylının, bayatının özünü yaradan Hüseyn Kürdoğlu ədəbi tənqidin diqqət mərkəzində idi. Amma bunu da qeyd etməliyəm ki, klassik poeziyamız və aşıq şeiri ilə müasir poeziya arasında yaranan daimi təmas və körpülərin etibarlı sakinlərindən biri də Hüseyn Kürdoğlu olmuşdur. Nədənsə mən XX əsr poeziyamızın ustadlarından olan Hüseyn Ariflə Hüseyn Kürdoğlu arasında (öncə bu barədə bir işarə verdim) daha doğrusu, onların yaradıcılıq dünyası arasında bir doğmalıq görürəm. Onların hər ikisi xalq ruhunun tərənnümçüsü idilər, klassik aşıq şeirinin – bu böyük poeziya ənənəsinin ləyaqətli davamçıları idilər, bu ənənəni müasir dövrdə yeni biçimdə, yeni bədii təfəkkür işığında inkişaf etdirirdilər. Onlar ənənənin əsiri deyildilər, bu ənənəyə canlılıq və poetik təravət gətirən şairlər idilər. Məlum məsələdir ki, "köhnə" hesab etdiyimiz formalarda bədii uğur qazanmaq olduqca çətindir, bunun üçün xüsusi poetik istedada malik olmalısan. Hüseyn Kürdoğlu "köhnə" havalara yeni ritm, yeni ahəng gətirən şairlərdən idi. "Hüseyn Kürdoğlu xalq ədəbiyyatını sevir" demək bəlkə də onun yaradıcılığına bəsit yanaşmaq kimi düşünülər. Hüseyn Kürdoğlu ədəbiyyata elə xalq ədəbiyyatının canlı təcəssümü kimi gəlib. Məlum məsələdir ki, xalq ədəbiyyatından təsirlənməyən şair tapmaq çətindir, amma təsirlənmək xalq ədəbiyyatı nümunələri səviyyəsində nəsə yaratmaq demək deyil. Hüseyn Kürdoğlunun yazdığı qoşmalar, gəraylılar, təcnislər, bayatılar əgər belə demək mümkünsə, "orijinal"a çox yaxındır. Onun təcnislərini bu sırada xüsusilə qeyd eləmək lazımdır. "Klassik və folklor ənənələrindən yaradıcılıqla istifadə etmə mədəniyyəti" (Qasım Qasımzadə) bu təcnislərdə və həmçinin cinas üstündə qurulan digər şeir formalarında aşkar nəzərə çarpır:

*Qobustan-daş adamlar,*
*Göz yaşım daşa damlar.*
*Duymaz daş adamları*
*Ürəyi daş adamlar.*

*Çiçəyə həmdəm arı,*
*Sızıldar dəm-dəm arı.*
*Mənim bağrımdan keçir*
*Dünyanın qəm damarı.*

*Söz varmış demə səndə,*
*Demirsən, demə sən də.*
*Sirrin gözdən oxunur,*
*Nə fərqi deməsən də?*

Böyük şairimiz Hüseyn Ariflə Hüseyn Kürdoğlu arasında bir doğmalıq olduğunu bir daha vurğulamaq istəyirəm. Bu doğmalığı şərtləndirən təkcə onların hər ikisinin folklorla, zəngin xalq ədəbiyyatı ilə bağlılığında deyil, həm də təbiət şairi kimi tanınmalarıdır. Təbiətdən yazmayan, gülə, çiçəyə, dağa, dərəyə, çölə, çəmənə şeir həsr etməyən şair tapmaq çətindir, amma əsl təbiət şairlərindən söz düşəndə barmaqla sayılacaq qədər şair adı üzərində dayanırsan: Hüseyn Arif, Hüseyn Kürdoğlu, Musa Yaqub, Məmməd Aslan – bu şairlər təbiəti öz dilində dilləndirən şairlərdir. Onların şeirləri təbiət vasitəsilə insanları, cəmiyyəti, dünyanı dərk etməyə səsləyən şeirlərdir. Biz onların şeirləri vasitəsilə təbiəti duyur, sevir və dərk edirik. Hüseyn Kürdoğlu da nədən yazırsa-yazsın, öz fikrini, hiss və duyğularını təbiət obrazları vasitəsilə açıqlamağa çalışır. Onun təbiət şeirləri barədə yazılan bəzi fikirlərə müraciət etmək istəyirəm. *"Hüseynin şeirlərində taleyin yox, təbiətin müdrikliyinə heyranlıq və pərəstiş var. Burada müdrik nəsihəti, hikmətli və ibrətli qənaətləri təbiətdən lövhələr – bədii peyzaj əvəz edir. Qartal qiyyəsi, çiçək təbəssümü, durna qatarı, çay nəğməsi, bulud karvanı olan dördlüklər formaca da, dil-ifadəcə də folklora, təbiətə doğmalığı ifadə edir" (Yaşar Qarayev). "Şairi təbiətlə bağlayan hansı mənadır, hansı istək, hansı idealdır? Əlbəttə, yalnız onun gözəlliklərindən estetik zövq almaq deyil. Belə olsaydı, şairin təbiətə münasibəti təmənnalı niyyət daşıyardı. Əslində isə şair təbiətin varlığındakı tükənməz, təmənnasız səxavətə heyrandır. Təbiətin bütövlüyündə, süniliyin ona yad olmasında mənalar axtarır. Təbiətə qovuşmağı, onunla birliyi arzulayır, poetik şəkildə ideallaşdırır" (Camal Mustafayev). "Hüseyn Kürdoğlunun poeziyası ana təbiətdəki ta-*

*razlığı, harmoniyanı vəsf edir. Hüseyn Kürdoğlunun şeirə gətirdiyi Laçın, Xaçın, Qırxqız, Yeddi qardaş, İşıqlı, Kirs... – bu poetik obrazlar müəyyən bir yurdun, ulusun təkcə adları yox, bütövlükdə Azərbaycanın poetik rəmzidir" (Cavanşir Yusifli).*

*Səhər-səhər şeh düzümü boynunu əyən*
*Göy otların yarpağı da titrədir məni.*

*Gedirəm, salamat qalın, meşələr,*
*Dağlar qoynundakı qalın meşələr.*
*Ürkək maralları gizlədin barı,*
*Otların qaydına qalın, meşələr.*

*Çırpınar, döyüşər yel yıxan ağac,*
*Sızlar balta ilə əl yıxan ağac.*
*Baxın, həlak olmuş igid deyilmi*
*Daşqın çay üstündə sel yıxan ağac?*

Belə misalların sayını qat-qat artırmaq olar. Hüseyn Kürdoğlu şeirləri mövzuca rəngarəng idi. İndi bunları bircə-bircə təsnifləndirmək, bölgülərə ayırmaq fikrindən uzağam. Ancaq bir məsələni qeyd etməyi lazım bilirəm: O, bütün şeirlərində səmimi idi. Həmişə axtarışda idi, onu tutduğu şeir yolundan, ənənələrdən ayırmaq mümkün deyildi. Bəzi yaşıdlarının və cavanların bir çoxunun poetik dəblərə uyduğu bir zamanda H.Kürdoğlu yenə ilk şeirlərindən birində dediyi kimi, yalnız "öz qəlbini tutub çalırdı". Dərk edir və anlayırdı ki, qaynaqlandığı xalq şeirinin potensial imkanları hələ tükənməyib, hələ bu çeşmənin suyu gur axır. Akademik Bəkir Nəbiyev haqlı olaraq yazırdı ki, Hüseyn Kürdoğlu müasirləri arasında dördlüyün, bayatının, təcnisin əsl ustadı idi. ...Hüseyn Kürdoğlu mənə bir bulağı xatırlatdı. Həmişə gur, duru bir bulağı. Əlbəttə, o bulağın suyu qurumayıb və nə qədər ki, Azərbaycan poeziyası var, o bulaq da qurumayacaq.

Hüseyn Kürdoğlunun qoşmaları, gəraylıları, rübai və bayatılarının içində artıq klassik nümunəyə dönən şeirlər də az deyil. Mən onun "Laçın bənövşəsi yadıma düşdü" qoşmasını XX əsr Azərbaycan poeziyasının ən gözəl incilərindən biri kimi qiymətləndirirəm. BƏNÖVŞƏ obrazı Qurbanidən üzü bəri neçə şairin ürəyini dilləndirib, amma bu sırada parlaq nümunələr o qədər də çox deyil. H.Kürdoğlunun Bənövşəsi isə ...heç nə demirəm, baxın, bu Bənövşə – Dərdimizin bənövşəsidir.

*Dərdim səhər-səhər bağçadan səni,*
*Gətirdim ad günü yara, bənövşə.*
*Laçın bənövşəsi yadıma düşdü,*
*Qanadı bağrımda yara, bənövşə.*

*Yetdi dövranımız yaman illərə,*
*Qırxqızın göz yaşı döndü göllərə.*
*Özünü qayadan atdı sellərə*
*Neçə əsir düşən Sara, bənövşə.*

Sonda qayıdıram o yuxuya. Hüseyn Kürdoğlunun üzünü mənə tutub "Dağlar azaddı" dediyi o Söz. Yuxudu bu, bəlkə H.Kürdoğlu ruhu bu yuxudan xəbərsizdi. Onun ruhu Laçının, Şuşanın, Kəlbəcərin, Xocalının başı üzərində dolaşır. Deyir ki: "Hər gecə Sarıbaba yuxuma girir mənim, bir ovuc torpaq verir, ah çəkir, dönür gedir". Deyir ki: "Gözlərimdən axır indi Həkəri, Dağ həsrəti dağdan ağır sələmdir". "Dağlar azaddı" dedi Hüseyn Kürdoğlunun ruhu. O dağlar bizim, biz də o dağların həsrətindəyik. O dağlar azad olsun, – deyirəm. Onda o dağlarda, o meşələrdə H.Kürdoğlunun ayaq izləri də bizim yol yoldaşımız olacaq.



**Vaqif YUSİFLİ**

**POEZİYA**



**Rəfiqə ƏSGƏROVA**

**VƏTƏN ƏSGƏRİ**

Yurdun keşiyində mətin dayanan,
Qeyrətli oğul ol, Vətən əsgəri.
Bunu arzu edib atanla anan,
Qoru sərhədləri, Vətən əsgəri.

"Vətənə borcluyam" deyirsən hər an,
Layiqli övlad ol, andına inan.
Düşmənə həddini bildir, uddur qan,
Azəri oğlusan, Vətən əsgəri.

Zirək ol, ayıq ol daim səngərdə,
Qan uddur düşmənə ön cəbhələrdə.
Səbirli, ağıllı hərəkətinlə
Vur başa borcunu, Vətən əsgəri.

Allah açıq etsin sənin yolunu,
Bükülməyən etsin güclü qolunu.
Neçə göz gözləyir sənin yolunu,
Sevimli balamsan, Vətən əsgəri.

Yamanca görünür yerin, nişanın,
Gözün yolda qoyma ata-ananın.
Həyətdə bağlanıb qoçdan qurbanın,
Gəl sevinək, gülək, Vətən əsgəri.

Xalaların darıxıbdır deyil sirr,
Yolunu gözləyir Nərminlə Mahir.
Sevənlər Allahdan səbir diləyir
Xoş gün, ruzgar üçün, Vətən əsgəri.

Tanrı heç pozmasın şən növrağını,
Gəl yandır evinin şam-çırağını.
Sülh olsun, məhv elə top-yarağını,
Gül açsın hər arzun, Vətən əsgəri.

## GETMƏK İSTƏYİRƏM O YERLƏRƏ MƏN

Getmək istəyirəm o yerlərə mən,
Qəlbimin əzabı azala bəlkə.
Görmək istəyirəm o yerləri mən,
Dərd-qəmim bir qədər azala bəlkə.

Ağ Qaya üstünə arzumdur çıxam,
Doğma kəndimizə oradan baxam.
Düşmənin qəlbini yandıram, yaxam,
Həsrətli gözlərim dincələ bəlkə.

O uzun yolları eyləyib yarı,
Böyük Düzdən keçəm Pöhrəyə sarı.
Bir göz qırpımında kəndimə sarı
Yol alam, nisgilim azala bəlkə.

Orda bir el vardı köklü-budaqlı,
Nəsillər yaşardı min-min soraqlı.
Şəhid igidləri dağtək vüqarlı,
Adları qəlbimə yazıla bəlkə.

Ay Allah, bu qədər həsrətmi olar?
Vətəndə vətənsiz olmaqmı olar?
Laçınsız ürəyim boşalar, dolar,
Yuxularım tərsə yozula bəlkə.

## ATA

Başımın tacıydın, qürurum idin,
Yaman tez ötüşdü xoş dövran, ata.
Zaman-zaman necə görünür yerin,
Qəlbimdə ucadan ucasan, ata.

Qorxu bilməz idim heç vaxt yanında
Güvənc, güc duyardım sənin adında.
Daha ruhun gəzir doğma məkanda,
Bizdən nigaransan, nigaran, ata.

Tapardın dərdimin hər bir çarəsin,
İşlər düzələrdi gələndə səsin.
Mənə təsəlliydi isti nəfəsin,
İndi haqq evində uyuyan ata.

Gözündən kənara qoymazdın məni,
Yenə yada saldım olub-keçəni.
Qovardın üstümdən dumanı, çəni,
Sənsiz ötüb keçmir heç duman, ata.

Addımbaşı kədər mənə tuş gəlir,
Bahar əvəzinə qarlı qış gəlir.
Yaşımın üstünə yenə yaş gəlir,
Yoxdu yoxluğuna bir dərman, ata.

Qalib gələcəyəm yağıya, yada,
Şərəflə qalacaq adım dünyada.
Yox olacaq başımızdan qan-qada,
Sevinəcək qızın o zaman, ata.

**PUBLİSİSTİKA**



## “BABAMIN GÜNDƏLİYİ”

## MÜHARİBƏ
## və yaxud
## YADDAN ÇIXMAZ QARABAĞ...

Babam mənim üçün Qarabağın canlı salnaməsi idi. Onun Qarabağ haqqında söhbətləri kitablarda oxuduqlarımdan, filmlərdə gördüklərimdən də çox duyğulandırıb məni. O, təkcə Qarabağın tarixindən, təbiətindən, mədəniyyətindən yox, sadə insanlarından, böyük kişilərindən, adət-ənənələrindən də danışardı. Bu söhbətlər yaddaşımın qızıl səhifələridir. O səhifələri “Babamın gündəliyi”ndə oxucularla bölüşəcəyəm...

...Mən erməni görməmişəm, heç görmək də istəmirəm. Çünki erməni sözü eşidən kimi gözlərimin önünə MÜHARİBƏ, viran edilmiş şəhər və kəndlər, vəhşicəsinə qətlə yetirilmiş qocalar, qadınlar, körpələr, Şəhidlər xiyaban(lar)ı gəlir. Ona görə də mən ermənilərə nifrət edirəm. Onlar mənim Vətənimin ən gözəl şəhərlərini viran qoyublar, sakinlərini isti ocaqlarından didərgin salıblar. O didərginlərdən biri də babam idi. Babamın bu dünyadan Qarabağ nisgili, yurd həsrəti ilə köçməsi isə yaddaşımı çox ağrıdır. Qarabağ müharibəsi babamın azı yeddi ilini geri salmışdı. Ömrünün sonunu gözləyirdi, amma Qarabağsız can vermək istəmirdi. Tanrıdan bircə diləyi vardı: evinə qayıtmaq, orada ölmək, bir qarış Qarabağ torpağına dönmək. Elə hey deyirdi ki: “...qorxuram Laçın həsrəti ilə öləm, Ağdam nisgili ilə gedəm...” Amma Qarabağa dönəcəyinə də inanırdı. Möcüzə gözləyirdi. Möcüzə baş vermədi...

...Babam dünyasını dəyişdi. 96 yaşında. Bu, çox gəlməsin sizə. Əslində, 96 ilin neçəsini yaşadı babam, deyə bilmərəm. Çünki o, hər kəsə qismət olmayan bu uzun ömründən zövq ala bilmədi...

Babamın həsrəti vardı...

Köçkünlük ahıl çağında əsir-yesir elədi onu, elədən-elə, belədən-belə qovdu. Bilmədi nəyin dərdini çəksin, kimin hayına qalsın, hara üz tutsun. Qarabağdakı abad evindən sonra şəhərin basırığına, hay-küyünə uyuşa bilmədi. Son üç ildə isə yorğan-döşəyə düşdü, yataq əsiri oldu. Yaş da öz işini görmüşdü, cavanlığından əsər-əlamət qalmamışdı. Heç elə bil şəkildəki o yaraşıqlı kişi deyildi. İşığı sönməkdə idi. Ağır kədər çökmüş, dərd yuva salmış gözləri ilə, acı təbəssümlə hərdən elə baxardı ki, o baxışlara tab gətirmək olmurdu. Məsumluğu adamı varından yox edirdi. Daha heç kimi

tanımırdı, başının üstündən çəkilməyən, körpə uşaq kimi qayğısını çəkən övladlarını da. Danışa da bilmirdi. Di gəl ki, bütün günü "Sarıbaba... Xırmanlar... Laçın..." dilindən düşmürdü. Yuxuda sayıqlayırmış kimi bu üç kəlməni tez-tez təkrarlayırdı, vəssalam...

Bilirdim, yaddaşında çox şey vardı, çox. Amma indi deyə bilmirdi, daha heyi qalmamışdı...

Mən babamı çox istəyirdim, bir nəvənin öz babasını istədiyindən daha çox. Babam əzab çəkirdi, onun əzabına biz də dözə bilmirdik. Əlimizdən isə heç nə gəlmirdi. Artıq həkim, dava-dərman da köməyə çatmırdı. Hər dəfə babamın bir dəri-bir sümük qalmış əlinin üstündən qabarıb çıxan damarına iynə vurulanda ürəyim sancırdı. Babama baş çəkməyə gələnlər isə elə hey eyni şeyi deyirdilər: "Kişinin həsrəti var, kişinin nisgili var, ona görə canını verə bilmir..." Hərdən onlara acığım tutardı: babam niyə ölməlidir ki! Axı, o, ev-eşiyinin həsrəti ilə yaşayırdı, Qarabağa dönmək üçün günlərini sayırdı!..

Babamın həsrəti vardı... Mən yaxşı bilirdim bu, nə həsrətdir. Bu, bir ovuc torpaq həsrəti idi. Bu, Laçın dərdi, Sarıbaba nisgili, Turşsu yanğısı, Ağdam ağrısı idi. Bu, yaddan çıxmayan Qarabağ dərdi idi. Bu nigarançılıq qoymurdu ki, kişi öz ömrünü rahatca başa vurub getsin bu yalançı dünyadan. Haqq dünyasına, Allahın dərgahına qovuşsun...

Oxuduğum bir kitabın qəhrəmanını tez-tez xatırlayırdım: nəvəsi yurd həsrətindən can verə bilməyən babasına "dərman" üçün erməni işğalında olan kəndlərinə keçir, əliyalın, silahsız-filansız. Cəsarətinə, qeyrətinə güvənib keçir. Və "qurd ürəyi yemiş" bu gözünə döndüyüm dəliqanlı bir ovuc torpaq gətirir babasına. Torpaq gələn günü kişi canını tapşırır... Elə düşünməyin ki, babamın ölümünü istəyirdim. Əstəğfürullah! Məni ağrıdan o idi ki, niyə babamın həsrətini ovuda bilmirik? Niyə onu dilindən düşməyən "Sarıbaba"sına, "Xırmanlar"ına, "Laçın"ına, "Ağdam"ına apara bilmirik? Niyə axı babam öz evindən didərgin düşüb? Niyə axı babam Qarabağına həsrətdir?..

Babam dünyasını dəyişdi... Evinə dönməyə taqəti, səbri, ömrü çatmadı. Öz əlində olsaydı... İndi onun yaddaşımı yandıran sözləri beynimi alov kimi qarsır: "...qorxuram Laçın həsrəti ilə öləm, Ağdam nisgili ilə gedəm..." Hər dəfə belə deyəndə ürək-dirək verərdik. İndi isə elə hamımızı qınayıram: niyə babamı (babalarımızı) Qarabağa apara bilmədik!..

***

...Babamı el adəti ilə dəfn elədik. Amma Bakıda, Ramana kəndində. Anasının qəbri Laçında, Xırmanlarda qalmışdı. Əvvəllər tez-tez deyirdi ki, məni ya Xırmanlarda anamın yanında basdırarsınız, ya da Ağdamda "sevgi-

lim Sitarə"nin yanında. Əliniz hansına tez çatsa! Amma biz babamı Ramanadan o tərəfə apara bilmədik, gücümüz onu bu kənddə dəfn etməyə çatdı, Xırmanlarda yox! Heç Ağdama da əlimiz yetmədi, onu "sevgili"si Sitarəyə də "qovuşdura" bilmədik!..

Cümə axşamı qəbirüstünə getdik: babamın ziyarətinə. Payız girsə də, hava çox isti idi, göydən od yağırdı, lap yayın cırhacırında olduğu kimi. Amma nədənsə mənə elə gəldi ki, babamın qəbri üşüyür. Bu torpaq babamın qəbrinə yaddır. Bu qəbir sanki dil açıb qərib olduğunu aləmə car çəkirdi. Yəqin elə ruhu da qəribdi. Hərdən mənə elə gəlir ki, babamın nigaran ruhu əsir-yesir qalıb Laçınla Ağdamın, Ağdamla Bakının arasında... Yuxarıda dediyim "sevgili" sözü də qəribə gəlməsin sizə. Babam ölənə qədər Sitarə nənəmi, ona səkkiz övlad bəxş edən, amma taleyindən yarımayan ömür-gün yoldaşını "sevgilim" deyə xatırladı, "sevgilim" deyə əzizlədi, "sevgilim" deyə oxşadı. Bu, təkcə babamın yox, qarabağlı kişinin (kişilərin) sədaqətinin örnəyi idi...

Babamın gündəlik yazmağını çox sonralar bildim. Bu gündəliyin tarixi isə elə "sevgilisi" Sitarənin faciəsi ilə başlayır. Bu faciənin tarixini "Ömrüm qurğuşun yükü..."ndə yazacağam...

***

İsmayıl babam iki dəhşətli müharibə görmüşdü. Sovet-alman müharibəsinin od-alovundan keçmişdi. Ayağının baş barmağı müharibədə "qalmışdı". Babam hərdən olmayan barmağını ovuşdurub elə ufuldayardı ki, onda elə bilərdim ağrıyan müharibədir. 1941-1945-ci illər müharibəsinin acılarını babamın gündəliyindəki hər cümlədə hiss edirsən. Heç vaxt unuda bilməyəcəyi hadisələri gündəliyinə "danışıb". Müharibədən yaşıl rəngli qələmlə yazıb: "Bu müharibə hamının gününü göy əsgiyə düymüşdü, ona görə yaşıl rənglə yazdım..."

"Müharibəyə könüllü getdim. Bilmirdim ki, o, əsl cəhənnəm imiş. Yanımda hər an, hər dəqiqə adamlar ölürdü. Hər yerdən ölüm qoxusu, qan iyi gəlirdi. Qollarımın arasında o qədər igid, o qədər gözəl qız keçindi ki. Biri heç gözlərimin önündən getmir. Ayaqlarının ikisini də itirmiş bir qız: "İndi mən kimə lazımam, yalvarıram öldürün məni" deyə gözünün yaşını sel kimi axıdırdı. Sonralar ondan xəbərim olmadı. İndi də dəhşətə gəlirəm, necə oldu ki, mən sağ qaldım. Hərdən o müsibətləri yuxuda görürəm. Oyananda inana bilmirəm ki, sağam..."

Babam mənim gözümdə qəhrəman idi. Müharibədə dəfələrlə ölümlə üzüzə gəlib, amma sağ qalıb. Deyirdi ki, Allah saxladı məni, yoxsa mən də

milyonlar kimi ölə bilərdim. Babam şükürlü insan idi, sağ qaldığına görə həmişə Allaha dua edərdi...

"Babamın gündəliyi"ndən: "...Şükür Allaha, Cabbar, Əli, Firəddin, (qardaşları – S.C.) də müharibədən qayıtdı, amma yaraları ömürləri boyu onları incitdi. Əmim oğlundan qara kağız gəldi, bibim gözüyaşlı qaldı. Qonşumuz Alagöz arvadın dərdi isə nə göyə sığırdı, nə yerə. Müharibəyə iki oğul göndərmişdi, heç biri qayıtmadı. Yazıq arvad son nəfəsinədək ümidini üzmədi, inanmadı qara kağıza, gözlədi. Ölənədək hər gün onlara süfrə açdı. Əlinə düşəni üfləyə-üfləyə balalarına saxlayar, hər gün süfrə bəzəyər, gecə yarısınadək gözləyərdi. Sübh tezdən isə süfrəni yığışdırar, oğlanlarının payını qonum-qonşuya paylayar və təzəsini açardı. Elə hey deyirdi ki, gələcəklər. 30 il belə gözlədi. Nə yazıq, 75-də (1975-ci il – S.C.) axirət evinə özgələrin çiynində getdi..."

Babamın gündəliyində o qədər belə ağrılı epizodlar var ki. Müharibənin günahsız insanların taleyinə bəxş etdiyi bu ağrıları ağrısız oxumaq olmur...

Gündəlikdən daha bir səhifə. O səhifədə babam ilk sevgisindən danışır. Onları MÜHARİBƏ ayrı salıb. "...45 nəfər tələbə idik. Hərəmiz bir rayondan gəlmişdik Bakıya: Südavər Qubadlıdan, İslam Zəngilandan, mən Laçından... 1941-in iyununda təhsilimizi bitirib rayonlara təyinat aldıq. Südavər Qubadlıya, mən Laçına getdim. Əhd-peyman bağlamışdıq... Qəfil müharibə başladı və bu müharibə gözümün ilk ovunu da əlimdən aldı. Mən geri dönəndə Südavər başqasına ərə getmişdi. Onun əhdə xilaf çıxması məni az qala dəli-divanə edib çöllərə salmışdı..."

"Babamın gündəliyi"ni oxuyuram... Və bütün MÜHARİBƏlərə nifrət edirəm...

***

Sovet-alman müharibəsinin taleyinə vurduğu yaralar sağalmamış Qarabağ müharibəsi haqlayıb babamı. Bu müharibə ona əvvəlkindən də "baha" başa gəlib. Bu müharibənin gətirdiyi yurd itkisi, didərginlik, köçkünlük dərdini "ovutmaq" o qədər də asan olmayıb...

"Babamın gündəliyi"ndən: "Lənətə gəlmiş bu müharibəni qonşularımız törətdilər, Azərbaycanın çörəyini yeyən nankor ermənilər. Onlar faşistlərdən də betərdilər. Onlar ağlasığmaz məşəqqətləri öz evimizin içində törətdilər. Erməni qradlarının, mərmilərinin... səsi sovet-alman müharibəsini yadımdan çıxardı. Gözəl yurdum murdar erməninin ayaqları altında qaldı, ilk beşiyim, qəbirlərimiz əsir düşdü. Nəslim-köküm didərginə döndü. Ev-eşikləri, sərvətləri əllərindən çıxdı. Cavanlarımız şəhid oldu. ...Dostum Həmdəm kişinin dərdi çox böyük idi. Tək oğlu şəhid oldu. Yazıq, bircə oğlundan sonra dözmədi, canına qəsd elədi. Xanım arvad isə göz yaşı içində yaşadı ömrünü, bu

nisgillə də köçdü dünyadan. ...Bayram kişinin dərdi də dillə deyiləsi deyil: lay divar kimi oğlu İlham Qarabağ müharibəsində itkin düşdü, "nə öldü, nə qaldı" xəbəri gəldi. İndiyədək Bayram kişi gözlərini yollardan yığa bilmir, Suğra arvadın gözlərinin yaşı qurumur: "Bəlkə, sağdı, bəlkə qayıtdı? Qəbri də yoxdu ki, gedib ürəyimi boşaldım..." ...Mən Xocalı faciəsi haqqında çox oxumuşam. Babamın yazdıqları isə yaddaşımı göynədir: "26 fevralın səhəri tezdən şəhər mərkəzinə getdim. Əslində, həmin gecə bütün Ağdam ayaq üstə idi, uşaqlar da (əmilərim – S.C.) gecəni evə gəlməmişdilər. Məscidin qarşısında iynə atsan, yerə düşməzdi. Məscid meyitlə dolu idi. Bu müsibəti qanlı görsəydi, qan ağlayardı. Görünməmiş işgəncələrə məruz qalmış xocalılar. Gözlər olsun, görməsin. Bu müsibəti insan cildinə girmiş, insan qanına susamış ermənilər törətmişdi. Adamlar nə edəcəklərini bilmirdilər: qadınların naləsi ərşə çıxırdı, kişilər hiddətlənmişdilər... Həmin vaxt Ağdam özü də aramsız atəşə tutulurdu. Qonşumuz Mikayıl kişinin Xocalıda yaşayan qızı da min bir müsibətlə gəlib çıxmışdı Ağdama. Ayaqlarını don vurmuşdu..." Babamın sözləri beşinci sinifdə Xocalı faciəsi haqqında yazdığım inşanı salır yadıma: "...Mən atamı, anamı, qardaşımı çox sevirəm. Bilirəm, deyəcəksiniz ki, bunun Xocalı faciəsinə nə dəxli var? Yox, belə deyil. Ermənilər Xocalıda səkkiz ailəni bütünlüklə məhv ediblər, o ailələrdən bir nişanə belə qalmayıb. Xocalı faciəsi haqqında oxuduqlarımdan ən çox bu, yadımda qalıb. O da yadımda qalıb ki, bunu ilk dəfə oxuyanda çox ağladım. Mən ataları, anaları, uşaqları öldürən ermənilərə nifrət edirəm..." "Babamın gündəliyi"ni oxuyuram, oxuduqca da qəzəbdən yumruqlarımı düyünləyirəm. Və bütün MÜHARİBƏlərə nifrət edirəm...

***

"Babamın gündəliyi"ni bütünlüklə yazıya köçürmək fikrində deyiləm. Bu gündəlik MÜHARİBƏ(lər)nin insan həyatına gətirdiyi faciələrin mənzərəsidir, əslində "MÜHARİBƏ" çox ağır sözdü. Bundan amansız, bundan zalım söz, bəlkə də, dilə gətirmək mümkün deyil. "Babamın gündəliyi" bu həqiqəti bir daha anlatdı mənə. Müharibə babamın dediyi "cəhənnəm"dir. Ermənilər yurdumuza gətirdilər o cəhənnəmi. MÜHARİBƏ: işğal olunan Şuşadır, Xocalıdır, Laçındır, Ağdamdır, Cəbrayıldır, Füzulidir, Xocavənddir, Kəlbəcərdir, Qubadlıdır, Zəngilandır, Ağdərədir; əsir düşən cənnət Qarabağdır! Bir milyon insanın köçkünlük dərdidir, tapdanan hüququdur, 20 mindən çox azərbaycanlının qapısını döyən "qara kağız"dır, oğul əvəzinə evlərə qayıdan "qara qutu"lardır, şəhid analarının qurumaq bilməyən göz yaşlarıdır; 50 mindən çox əlildir; ayaqları kəsilən xocalıların, qaradağlıla-

rın... sızım-sızım sızıldayan yaralarıdır. Əsir qızların erməni gülləsinə tuş gəlmiş gəlinlik, analıq haqqıdır...

DAHA SADALAYA BİLMİRƏM. AĞIRDIR...

Birini də deyim, vəssalam. Müharibə babamın nisgilidir. Ermənilər evində yaşamaq, dincəlmək və nəhayət, ölmək haqqını çox gördülər ona. Sənin qisasını onlardan alacağam, baba! Bu nisgili onlara bağışlamayacağam!...

Bu gündəlik bir əmanətdir. Bu əmanət məni Qarabağa səsləyir. Öz vətənində "qərib"ə dönən babama bir borcum var: bu gündəliyi ilk yazıldığı ocağa – Qarabağa aparmaq! Onun ruhunu sevindirmək! O günü çox gözləyirəm. Elə isə...

## O GÜNƏ GECİKMƏYƏK!..

Yaddaşımızı korşaltmayaq, yaddaşımızı dondurmayaq! Donmuş ürəkdə torpaq sevgisi olmaz! Babalarımızın gündəliklərini tez-tez vərəqləyək! Yurd yerlərimizlə bağlı xatirələri yada salaq! Tökülən qanları unutmayaq! Bu torpağın xilası naminə meydana atılan, şəhid olan cəngavər oğulları xatırlayaq! Sinəsi dağlı ata-anaları, igid ər itirmiş gəlinləri, "qardaş" deməkdən dili qabar olmuş bacıları, "ata" kəlməsinə həsrət körpələri yada salaq! Dədə-baba qəbiristanlıqlarında uyuyanları, qərib məzarların sahiblərini yad edək!..

Xatırlanmağa haqqı olanları xatırlayaq! Yada salaq! Yad edək!.. Və həm də düşünək! Bax o anda qisas hissi bizi rahat buraxmayacaq! Bax o anda ilahi bir hökm eşidəcəyik: "Öncə Vətən!" O hökmün iradəsinə tabeçilikdədir nicatımız!..

Evdə yazı stolumla üzbəüz divardan Azərbaycanın xəritəsini asmışam. Xəritəni özüm çəkmişəm. Onu çəkəndə ürəyim parçalanıb, çünki bu xəritə də Azərbaycanımız kimi yaralıdır. Alçaq ermənilər Vətənimin köksünü yarıblar. Ürəyi paramparça Anaya baxmaq dözülməzdir. "Yaralı Azərbaycan"ı gözümün önündən asmışam ki, hər baxanda gözlərimi acıtsın! Acıtsın, ağrıtsın, incitsin ki, onun yaralı olduğunu unutmayım! Heç birimiz unutmayaq! O zaman bu ağrıya dözməyib Qarabağa üz tutacağıq! Qarabağa doğru gedəcəyik! Mütləq gedəcəyik! Çünki "YADDAN ÇIXMAZ QARABAĞ....



**Sitarə CABBARLI**

